Kitab XIX əsr görkəmli Azərbaycan şairi
Mirzə Əbdülxalıq Yusifin (1851-1924)
160 illik yubileyinə ithafdır.

Nəşrə hazırlayan
və
ön söz müəllifi:

**SONA XƏYAL**

Mirzə Əbdülxalıq Yusif. Qəzəllər.
Bakı, "MBM", 2012, 124 səh.

XIX əsrdə yaşayıb yaradan, öz dövründə Qafqaz şairlərinin önündə gedən və o taylı-bu taylı Azərbaycanda məşhur şair kimi tanınan Mirzə Əbdülxalıq Yusifin "Diriltdi aləmi eşqin nidası" adlı şeirlər kitabı (2002) və şair haqqında "Mirzə Əbdülxalıq Yusif" adlı monoqrafiyamız (2000) nəşr olunub oxuculara çatdırılmışdır. Şairin bu kitabında isə yalnız çap olunan və çap olunmayan qəzəlləri toplanmışdır.

ISBN 978-9952-29-043-8

# MİRZƏ ƏBDÜLXALIQ YUSİFİN QƏZƏLLƏRİ

Azərbaycan XIX əsr poeziyasının görkəmli nümayəndələrindən biri olan, hələ sağlığında o taylı-bu taylı Azərbaycanda dəyərli şair kimi tanınan və sevilən Mirzə Əbdülxalıq Yusif 1851-ci ildə Bakıda (İçərişəhərdə) anadan olmuşdur. Mollaxana təhsili alan Əbdülxalıq ərəb və fars dillərini mükəmməl öyrənmiş və üç dildə şeirlər yazmışdır. 18 yaşında ikən əruz vəzninin müxtəlif janrlarda şeirlər yazmış, "Məcməüşşüəra"da şeir oxuyarkən böyük şairlər tərəfindən həmişə bəyənilmiş, alqışlanmışdır. Çox güman ki, atasının adı Yəqub olduğu üçün özünə "Yusif" təxəllüsünü götürmüşdür.

Mirzə Əbdülxalıq Yusif öz dövründə keçirilən şeir məclislərinə başçılıq etmiş, bir çox şairlərin yetişməsində böyük xidmətlər göstərmiş, o cümlədən Əliağa Vahidin müəllimi olmuş və ona "Vahid" təxəllüsünü vermişdir. Yusif o dövrün görkəmli şairlərindən olan Seyid Əzim Şirvani, Məhəmmədağa Cürmi, Əbdülhəq Mina, Əbdülxalıq Cənnəti, Haşım bəy Saqib, Ağadadaş Müniri, Azər Buzovnalı və başqaları ilə dostluq etmişdir. O, təkcə Bakı şairləri arasında deyil, Azərbaycanın digər bölgələrində də tanınan və sevilən bir şair olmuş, həmin bölgələrdəki şeir məclislərinin üzvləri ilə əlaqə saxlamış və məktublaşmışdır.

Yusif şeiri təkcə sağlığında deyil, ölümündən sonra da dildən-dilə gəzmiş, daim xanəndələrin repertuarında layiqli yer tutmuşdur. Qəzəlin Allahı saydığımız ulu Füzulidən bu yana şeir xəzinəsini bəzəyən incilər içərisində Yusif qəzəlinin öz mərtəbəsi vardır. İstər mövzu, istərsə də bədilik cəhətdən rəngarəng olan Yusif şeiri bir əsrdən bir qədər az, bir qədər çox ömrə malik olsa da, özündə neçə-neçə ömrü hifz edib saxladığına görə, neçə-neçə insanın sevinçini, kədərini, neçə-neçə dünya hadisəsini, neçə-neçə qəzavü qədəri bizə çatdırdığı üçün ikiqat dəyərlidir.

Yusif yaradıcılığında sözün bədii dəyərini, şeiriyyəti yüksəltmək üçün bədii vasitələrdən gen-bol istifadə etmişdir. Sadə məcazlardan–təşbeh və epitetdən tutmuş, mürəkkəb məcazlara–mübaliğə, kinayə və istiarəyə kimi işlədilən bədii vasitələr şeirin emosional təsir qüvvəsini artırmış, Yusif qələminin qüdrətini daha da yüksəltmişdir. Poetik nitq təşbehlərlə bəzənmiş, epitetlərlə zəngin olanda, onun oxucular tərəfindən yüksək sənətkarlıq nümunəsi kimi qəbul olunması ehtimalı daha yüksək olur. Məsələn, şairin qəzəllərində rast gəldiyimiz bəzi məqamlara diqqət edək: "Xəlqə rövşənlik üçün vasitə ol sim kimi", "Şir tək qıl həmlə dərdü qəm əfvacinə" misralarında xalqa xoşbəxtlik, işıqlı gələcək bəxş edən insanın elektrik naqili ilə müqayisəsi, dərdə, qəmə daim sinə gərən, tülkü kimi rahatlıq tapmaq üçün hiyləgərlik etməyib, mübarizə yolu ilə öz-özünə dolanışıq üçün lazım olanları əldə edən insanın şirə bənzədilməsi şeirin bədii çəhətdən dəyərini daha da artırmışdır. Eləçə də "Müjgan oxun atanda ol mahparə bir-bir", "Kimdir ki, verməsin könül əbrukəmanlara" misralarında sevgilinin, yarın, ümumiyyətlə məşuqun ay parçası, qaşıkaman və s. verilməsi şeirlərin poetikasını yüksəltmiş və emosional təsirini çoxaltmışdır.

Poetik dilin ən təsirli vasitələrinə müraciət etmək, bununla da əsl sənətkarlıq nümunələri yaratmaq, parlaq bədii boyalarla şeir adlı gəlinə bəzək vurmaq və bununla da yaratdığın gözəli oxucuya sevdirmək, doğrudan da, şairdən böyük baçarıq tələb edir. Yusif qəzəlində biz bu sənətkarlığı bütün dolğunluğu ilə açıq-aydın görürük.

Mürəkkəb məcazlardan mübaliğə klassik şeir üçün çox təbii sayılan, məqbul hesab edilən bədii vasitədir və bunsuz romantizmi təsəvvür etmək mümkün deyildir. Aşiqin çəkdiyi əzab-əziyyəti, hicran gecəsinin yanğısını, can alan, qan tökən məşuqun zülmünü və bu zülmün aşiqə verdiyi nəşəni, ilahi eşqin böyüklüyünü, məhəbbət dəryasının təlatümünü, eşq atəşinin yandırıcılığını, bir sözlə romantik şeirin gözəlliyini böyütmək, artırmaq üçün mübaliğə ən dəyərli vasitədir. Şairin bir sıra

qəzəllərində bu cür obrazlı deyimlərə, mübaliğəli fikirlərə rast gəlirik: “Rüxsarına deyibdilər Xurşiddir vəli”, “Şəhi-iqlimi-hüsnü Yusifi-Misri-məlahətsən”, “Sən ol yari-Məsihaxislətü Xurşidtələtsən”, “Min dağ gizlənib bu dili-dağdardə”, “Bir belə dərdü qəmü firqətə ey şirindil, Bisütun tab gətirməz, o ki Fərhad olsun” və s. misralarda yarın üzünün Günəşdən də gözəl olması, sevgilinin hüsn iqliminin şahı, məlahət Misrinin Yusifi hesab edilməsi, hicr atəşindən, məşuqun cövründən aşiqin dağlı sinəsində min dağın gizlənməsi, aşiqin dərdinə, fərağına nəinki Fərhadın, hətta Bisütunun tab gətirə bilməməsi mübaliğədir və bəziləri hədsiz dərəcədə şiddətlidir. Lakin bu heç də Yusif şeirinin məntiqini pozmur, onun məna dəyərinə xələl gətirmir, əksinə onun bədii təsirini daha da güçləndirir.

Yusif şeirində lirika üstün olduğu üçün onda kəskin kinayələr azdır. Onlarda yumor çox incədir. Lakin şair elə bu incə yumorla da özünəməxsus orijinal deyimlərlə öz sözünü deyir: ”Təxtü tacü səltənət fikrində olma, ey fəqir. Sanki çıxdın sən də bir gün təxtə Əhməd şah tək”, “Zahid, hənuz məsələdə iştibahı var, Pak olmayıbdı hindi də abi-qüsalədən”, “Mən deməkdən acizəm, xəlq anlamaqdan tərsini”, “Yetişib Yusifə, zahid, demə dünya qəmini, Yetər üqbadə görək kim, nə edər Xaliqimiz”, “Zahid sözün şəkəridir”, “Zahida, mən rəhi-meyxanə tutum, sən məscid, Görəlim aqibətində aparır kim kimi” və s. deyimlərində də şairin təsirli incə kinayələrinin şahidi oluruq.

Göstərilən misallardan aydın olur ki, Yusif yaradıcılığı öz bədii dəyəri, məna tutumu ilə klassik şeirimizdə görkəmli yer tutur. Şairin hər beytində, bəlkə hər misrasında bədii vasitələrdən, o cümlədən məcazlardan səxavətlə istifadə olunmuş, xüsusi şair sənətkarlığı, ustadlıq nümayiş etdirilmiş, oxucu zövqünün, oxucu təfəkkürünün maksimum nöqtəsini fəth edən yüksək sənətkarlıq nümunələri yaradılmışdır.

Yusif qəzəlinin dəyərli cəhətlərindən biri də qəzəl kimi tanıdığımız şeir formalarının öz adı ilə verilməsidir: təsniyyə, səngلax, fərq, kinayə. “Açıb çəməndə o sərvi-səmənüzar, üzar, Gəlib tərənnümə hər guşədə həzar həzar.” mətləli qəzəl "təsniyyə"

formasındadır, misraların sonunda sözlər iki dəfə, müxtəlif mənalarda verilir. Biz bu formaya poeziyamızın bir sıra görkəmli nümayəndələrinin yaradıcılığında rast gəlirik. Bəzi şairlərdə isə bu prinsip təkcə ikinci misrada gözlənilir, birinci misra sərbəst olur. Çoxlarında isə misranın sonunda sadəcə təkrar verilir. "Sənglax" əruzun kamil bəhrində yazılır, Yusifin bu formada iki qəzəli vardır. Bu formaya ilk dəfə Füzulinin Divanında rast gəlmişik. Orada bu bəhrdə cəmi bir qəzəl vardır. Bakı şairlərindən Biqələmin də bu formada şeiri vardır. Fərqdə əsər boyu hər beytdə müqayisələr aparılır, sonda ümumiləşmə verilir. "Kinayə" formasında isə şair şeir boyunca bəşərin elədiyi eybəcərlikləri sayır, sonuncu beytdə kulminasiya nöqtəsində kinayəsini tamamlayır. Axırıncı iki formaya fikir verdikdə görürük ki, adlar zahiri formadan çox batini mənaya görə verilmişdir. Burada məna formaya yenilik gətirir.

Yusif haqqında tədqiqatlarımız dəfələrlə çap olunduğundan burada onun qəzəlləri haqqında əhatəli söhbət açmaq istəmirik. Bu kitabı hazırlarkən oxucu kütləsini də nəzərə aldıq və bir sıra fonetik dəyişikliklər apardıq. Ancaq əruzun pozula biləcəyi təqdirdə əvvəlki şəkli saxlamağa məcbur olduq. Məsələn: “Səri-bazardə rüsvalıq olmaz” misrasında “bazardə” sözünü “bazarda” kimi, “Bidanişü ürfan necə hikmətdən urar dəm” misrasında “urar” sözünü “vurar” kimi, “”Dal”dür bir nöqtədə məcmui-mənidən xitab” misrasında “dal”dür” sözünü “dal”dır” kimi yazmaq oxunuşda təhrifə gətirib çıxardığına görə olduğu kimi verdik. Bəzi sözlərdə bu cür hərf dəyişmələri vardır, amma belə hallar o qədər də çox deyildir.

Mirzə Əbdülxalıq Yusifin dəyərli, bənzərsiz ədəbi irsi hələ də öz tədqiqatçılarını gözləyir.

***Sona Xəyal***
*AMEA-nın Məhəmməd Füzuli adına*
*Əlyazmalar İnstitutunun böyük elmi işçisi,*
*Azərbayxan Yazıçılar Birliyinin “İRS”*
*komissiyasının sədri*



Müsəlsəl zülfdür çin-çin olub dilbər kənarında,
Və ya ənbər saçılmış yari-siminbər kənarında.

İki xali-siyəh künci-ləbində eyləyib məskən,
İki zəncidi guya əyləşib Kövsər kənarında.

Tökülmiş arizi-al üzrə zülfün türfə gülşəndə,
Düzülmiş sünbüli-tər laleyi-əhmər kənarında.

Düri-dəndanını ləl içrə gördüm, söylədim bəh-bəh,
Nə layiqdir sədəf kim, bəsləsin gövhər, kənarında.

Rüxün zülf içrə görmüş zahidi-kəcbin xəyal eylər,
Bəli, çün görmək olmaz müshəfi kafər kənarında.

Camalın möcüzü xurşid tək afaqə rövşəndir
Ki, İbrahim tək məskən tutub azər kənarında.

Əgər bir sağər içrə mey ola, əlbəttə, ey Yusif,
O meydən bir əsər peyda olar sağər kənarında.





Kimdir ki, verməsin könül əbrukəmanlara,
Dil verməmək mahaldı bu dilsitanlara.

Pirani-parsadilü həftadsaləmiz,
Meydir muradı ta nə yetişsin cavanlara.

Söz yox, dəhanı var, o qədər təngdir ki, söz
Bir nüktədir, təvəllüqü var nüktədanlara.

Hər kim ki, cüzvi-layətəcəzzanı dərk edər,
Bir nöqtə dərkin etməyə düşməz gümanlara.

Bir gün şərarələr tökülüb yer üzün yaxar,
Əzbəs, çıxıbdır ahım odu asimanlara.

Qəmzən xədəngi oldu könüllərdə cayigir,
Çox yaxşı dəydi tiri-nigahın nişanlara.

Əhli-vəfanı seyd elə hər bir vəfasıza,
Atma oxun, dəyər biri, əlbəttə, canlara.

Yusif, əgər varındı hünər, olma meypərəst,
Dil vermə daxi türreyi-ənbərfəşanlara.

Sən məst, çeşm məst, cahan məst, badə məst,
Kim huşyardır, bu xəbər çatsın onlara.



Nihani bəslənirləlin xəyalı can arasında,
Bəli, can riştəsi vardır, deyirlər, qan arasında.

Qübari-məqdəmin didəmdə müşküldür məkan tutsun,
Nə nisbət var gədayi-məhz ilə sultan arasında.

Gözün tiği-müjənlə tökdülər bir ləhzədə qanım,
Vəli, məhv oldu bu qan çeşmilə müjgan arasında.

Camalın nurunu bu hüsnilə dərk eyləməz zahid,
O biçarə nə bilsin ki, nə var Quran arasında.

Zəminü asimanda hər qədər fərq olsa, vazehdir,
O qədri var məsafət zöhd ilə ürfan arasında.

Tikandan gül çıxar, adət budur, amma nə nisbət var
Nəzərdə xar ilə ol qönçeyi-xəndan arasında.

Əgər keyfiyyəti-mey, cəzbəyi-eşq olmasa, Yusif,
Təfavüt bəs nədir insan ilə heyvan arasında?





Könlüm xoş olur ol büti-zibayə baxanda,
Vəcd eylərəm ol zülfi-səmənsaya baxanda.

Nitqin görüb əşkim hünəri düşdü gözümdən,
Bir qətrədi bu bəhr o dəryaya baxanda.

Çeşmim baxa bilməz o dilaraya doyunca,
Əlbəttə ki, göz xirələnir Aya baxanda.

Məşuqunə bir kəs baxa, aşiq həsəd eylər,
Mən xoşlanıram xəlq o dilaraya baxanda.

Vəsl istə, behişt istəmə, ey zahidi-bizövq,
Dəyməz bu təmənna o təmənnaya baxanda.

Hicran ələmi zövqi-vüsal artırur, ancaq
Surət necə əlzəmdir o mənaya baxanda.

Yusif, nə qədər fikr edəsən eşqdən özgə,
Bir faidəsi yoxdu bu dünyaya baxanda.





Zülfi-xəmin ki, xəlq deyərlər, kəmənd ona,
Bir damdır ki, aləm olub payibənd ona.

Çeşmin ki, ehtiyat eləyir çeşmi-zəxm üçün,
Ol çöhrə bənzər atəşə, xalın sipənd ona.

Ayinə tək camalına həsrətdir ayinə,
Baxsan, hər ayinə olur ayinəbənd ona.

Zahid ki, bilməyir nədi sevdayi-zülfü xal,
Sevdayi-xalü zülf nə gəlir sudmənd ona.

Dünyaya vəzü pənd edər, amma düzünə heç
Təsiri yoxdu, kargər olmaz ki, pənd ona.

Yusif ki, asitaneyi-dildara baş qoyub,
Yetməz məqami-rütbədə çərxi-bülənd ona.





Biganələr əgərçi edərlər cəfa mənə,
Lütf eyləsə, qəm eyləmərəm, aşina, mənə.

Cövrü cəfaya dözmək olur yar üçün, vəli,
Yar eyləyərsə lütf ilə mehrü vəfa mənə.

Fikrü xəyaldır şəbi-hicranda munisim,
Ey didəmin ziyası, yetir gəl ziya mənə.

Sənsən mənə murad, muradım budur mənim,
Mən razıyam sən nə ki, görsən rəva mənə.

Hicranda, hər vəsilə ilə olsa, dilxoşam,
Çatdırdı buyi-zülfünü badi-səba mənə.

Amalımın nəhayəti sənsən, gərəkməyir,
Ey könlümün məsərrəti, səndən səva mənə.

Yusifdən etmə mərhəmətin kəm, fəqirdir,
Bir kəm inayətindi sərasər qəna mənə.





Tənha könül nə xalü xətti-yarə bənd olub,
Candan keçib ol türreyi-tərrarə bənd olub.

Bu rəsmdir həmişə gülə bənd olubdu xar,
Amma bu çox əcəbdi ki, gül xarə bənd olub.

Əzbəs ki, mehribandır o dildari-dilnəvaz,
Hər kəs sanır ki, xəlqə o məhparə bənd olub.

Göstərdiyiçün əksi-rüxün mah matdır,
Vəchi budur ki, ayinə divarə bənd olub.

Xalın ki, eyni-nöqteyi-pərgari-eşqdir,
Dünyanı gör, bu nöqtədə pərgarə bənd olub.

Dil əksi-ruyi-yar üçün ayinədir vəli,
Fərrar tək hər ayinə göftarə bənd olub..

Sirri-dəhani-yari deyər Yusif aşikar,
Sirri budur ki, külli-xiridarə bənd olub.

Çün fəqri-müstəhəqq kərəm fəqrə münhəsir,
Rəhmət həmişə eyn yenə karə bənd olub.

Bir tari-muyi-yardır eşqin həqiqəti,
Məcnuni-xəlqi gör ki, bu bir tarə bənd olub.



Zibəski, könlüm olub zülfi-yardən məhzub,
Şəbi-vüsaldə sanmaz nədir şimalü cənub!

Həsari-könlümə qalib degil müxalifi-qəm,
Sipahi-eşq ilə əfvaci-əql olub məğlub.

Ərağə təbi-hümayunum eyləyibdir övc,
O növ ilə ki, məsti-çeşmi-şəhraşub.

Segah, Şur, Hüseyni, Dügah, Məğnatis,
Sədayi-tar, sehri-pəncgah, cəzbi-qülub.

Həvayi-Şur ilə Şəhnazə güc edib üşşaq,
Nəvayi-neydə hüveydadı zikri-"Ya məhbub".

Şəbi-fəraqdə qəm çəkmərəm ki, var guya,
Nəsimi-sübhi-vüsalınçün ehtimali-hübub.

Xəyali-çöhrəvü zülfünlə bilmərəm hərgiz
Ki, gün nə vəqt tülu eyləyər, nə vəqt qürub.

Qoyubdu icz ilə kim bu asitanəyə sər,
Gərək ki, xakini müjgandan eyləsin carub.

Bəlayi-eşqdi bu, səhl sanma, müşküldür
Ki, inciyəndə davam eyləməz dili-Eyyub.

Məhəbbət aləminin cəzbəsin gör, ey Yusif
Ki, payimali-məhəbbətdi dideyi-Yəqub.



Tari-zülfün könlümə ahim kimi verdükcə tab,
Ahü əfğansaz edər sinəmdə bu cəngü rübab.

Cami-mey içdikcə qəlbim rövşən oldu sübh tək,
Rövşən eylər aləmi, əlbəttə, nuri-afitab.

Atəşi-hicran üzün fikrilə əşkim axdırur,
Gör bu növ ilə çəkər aləmdə kim, güldən gülab.

Versələr zəhr ilə xunriz olmaz əbrular kimi,
Təlxiyi-hicr ilə hərgah tiğeyi-şəmşirə ab.

Zahidin zöhdün məcaz ikən həqiqət bildi xəlq,
Yay günü su görsənir səhradə, seyr etsən, sərab.

Vaizin vəzin görən dərk eyləməz mey nəşəsin,
Əhli-cənnətdən, yəqin, tutmaz xəbər əhli-əzab.

Seyli-əşkim, ahü əfğanımdı hicrandan, demə,
Rədi-fəryad eyləyib, ya yağdırır baran səhab.

Əmri-müşküldür şəbi-hicranda, ruzi-vəsldə
Aşiqin qəlbində səbrü Yusifin çeşmində xab.



Mah ruxsarında zülfün müshəf içrə mişki-nab,
Hüsni-xəttin vəsfə gəlməz, gündə yazsam min kitab.

Ərseyi-cövlangəhimdə rayizi-ürfanıma,
Tövsəni-təbim təkapudən qalıb, verməz rikab.

Mən deməkdən acizəm, xəlq anlamaqdan tərsini,
Nöqteyi-məfhumu gər etsəm dəhanından hesab.

Yox deməm, var sirri, çünki etsələr məndən sual,
Şahidim bir nüktədir, nazik deyil mübhəm cavab.

Qamətindir əlfidən məqsud təlvihati-elm,
“Dal”dür bir nöqtədə məcmui-mənidən xitab.

Aləmi-mənidə surətdir məcazın məsləki,
Aləmi-surətdə mənidir məcazi-incizab.

İncimə, Yusif, əgər göftarını bilməzsə xəlq,
Xəlqə müşkül anladur bir lal, əgər gördüsə xab.





Bəzm içrə şəm, ruyi-canana bir tərəfdə,
Mən bir tərəfdə yannam, pərvanə bir tərəfdə.

Bir yanda zülfi-Leyli, bir yanda ahi-Məcnun,
Zəncir bir tərəfdə, divanə bir tərəfdə.

Bir üzdə tari-geysu, bir üzdə xali-hindu,
Bir dam bir tərəfdə, bir danə bir tərəfdə.

Məsciddə xəlq yatmış, vaiz nəsihət eylər,
Əfsürdə bir tərəfdə, əfsanə bir tərəfdə,

Mey şişədə, gül əldə nagah nigar gəldi,
Mey qaldı bir tərəfdə, peymanə bir tərəfdə.

Zahid, sözün şəkərdir, söz burda qalsın amma,
Dildar bir tərəfdə, meyxanə bir tərəfdə.

Yusif deyər fəhiməm, zahid deyər cinundur,
Gəncinə bir tərəfdə, viranə bir tərəfdə.





Bir danış, gül, açıl, ey qönçədəhanım, sən də.
Bir gəlib vəcdə, gəl, ey sərvi-rəvanım, sən də.

Hamı güllər açılıb, şurə gəlib bülbüllər,
Bari bir şurə gəl, ey ruhi-rəvanım, sən də.

Pirlər şövqə gəlib, vəcdə gəlib gülşən ara,
Qoy qədəm naz ilə, ey tazə cəvanım, sən də.

Gəkdi rəftarə çəməndə o büti-sərvqədim,
Görməyə bir düzəl, ey qəddi-kəmanım, sən də.

Pişvaz etməyə əzayi-bədən çıxdı tamam,
Cəhd qıl hümmət elə çıxmağa canım, sən də.

Çıx təmaşayə ki, ol sərvi-rəvan seyrə çıxıb,
Rövşən et yolları, ey ahi-nihanım, sən də.

Bir qədər sən də tut aram, ey aram, dəxi,
Bir qədər səbr elə, ey tabü təvanım, sən də.

O güli-bağı-məhəbbət yenə göstərdi üzün,
Bir zaman sakit ol, ey ahü fəğanım, sən də.

Seyr edər vəhm ilə kim, rəxtinə əyləşməyə toz,
Sula yollarını, ey əşki-fəşanm, sən də.

Yusifa, səy elə himmət qıl, əfəndim, qoyma
Müntəzir qalmağa çeşmi-nigəranım, sən də.



Desəm əqiqi-Yəmən, eylərəm cəfa, ləbinə,
Əgər şərab desəm, etmərəm vəfa ləbinə.

Həramdır desələr badə, ol lətafət ilə
Verir məqami-təkəllümdə gər səfa ləbinə.

Deyibdilər ləbinə rəşki-ləldir, heyhat,
Edibdilər bu təkəllümdə iftira ləbinə.

Nolaydı, bari-xudaya, tamam ömrümdə
Ləbim olaydı sənin bir də aşina ləbinə.

Olaydı kaş min canım, eyləyəydim ta
Dinəndə hər birini bir kərə fəda, ləbinə.

Ləbin təkəllümü, ölmüşdüm, etdi zində məni,
Məsih möcüzü var səndə, mərhəba ləbinə.

Müdam zində qalır ləblərin meyindən içən,
Nolur, əgər desələr çeşmeyi-bəqa, ləbinə?

Bu etibar ilə ifrat söylənər, hərgiz
Deyərsə Yusif əgər, ruhi-canfəza, ləbinə



Bir mahdır ki, yetmiş hüsni-hədi-kəmalə.
Yox ehtiyacı hərgiz təzyini-xəttü xalə.

Bir şey o yarə bənzər, olsun deyim onun tək,
Yoxdur məsəl cahanda ol şuxi-bimisalə.

Seyli-sirişkim axdı, ol sərvi-nazı görcək,
Cu verməsən, əlbəttə, göyərməz, nonihalə.

Elm əhlinin vicüdu iksirdir ki, hər mis
Yetcək ona edər teyr rahi-həzarsalə.

Sirri-ləbi-nigarı öz layiqincə, zahid,
Hərçənd qanmayırsan, fikr eylə laməhalə.

Hal əhlinin lisanın qal əhli dərk qılmaz,
Ya fındığa düyün vur, ya qandır əhli-qalə.

Əksilməsən, yəqin et, artmaz məqami-şənin,
Hər mah bədirlənməz, ta dönməsə hilalə.

Nuş istəyirsə Yusif, nişi qəbul qılsın,
Neylim fələk qatıbdır bu yerdə zəhri balə.



Zülfün məkan olan kimi şümşad şanəyə,
Könlüm quşu tərənnümə başlar təranəyə.

Möhtacdır nəvazişə bu dil o zülfilən,
Bərbüt kimi kim, hacəti var taziyanəyə.

Zahid rümuzi-eşqdən agah deyil hənuz,
Vəchi budur ki, cəng vurubdur bəhanəyə.

Qəvvas gövhər istəsə, candan keçər vəli,
Can istəyən yetişməz o dürri-yeganəyə.

Tiri-xəyalü zehn atıldıqda kəşf üçün,
Bəzi dəyər xilafinə, bəzi nişanəyə.

Hər bir xəyal mətləbə düz getsə, kəşf olur,
Neydəndir ixtilafi-nəzər damü danəyə.

Aləmdə tapmayınca bəşər ruhi-mənəvi,
Vaqedə yol taparmı bu gizlin xəzanəyə.

Başə düşərmi badə əyağında mey nədir,
Hər kəs ki, baş aparmasa bu karxanəyə.

Yusif, bu əsri-tazədə sən köhnə söyləmə,
Nitqin deyil nə isə müvafiq zəmanəyə.



Kim gördü mən görən sitəmi hicri-yardə?
Kim çəkdi mən çəkən qəmi bu ruzigardə?

Hicran əlindən ani ki mən çəkmişəm, yəqin,
Məcnun vətəndə çəkmədi, Mənsur dardə.

Bir dağə vurdu tişəni Fərhad o vəqt əgər,
Min dağ gizlənib bu dili-dağdardə.

Pərvanə tək vurardı özün narə hər zaman,
Olsaydı gər bu məndəki qəmlər həzardə.

Aləm bahar olanda sevər eyşü işrəti,
Bilməm, nə var ki, mən xəcil ollam bahardə.

Tərpətmə qara zülfünü, ey badi-sübhdəm,
Min dil yatıb ol silsileyi-tabdardə.

Naseh, məlamət eyləmə, verməzdim anə dil,
Olsaydım ol zamanda əgər ixtiyardə.

Eşq atəşində yandum, o qəmlər ki məndə var,
Əlbəttə, görməyib onu pərvanə nardə.

Yusif, tələsmə, dərdinin axır əlacını
Mən bilmişəm ki, kimdədi–pərvərdigardə!



Düşəndə şövqilə yarın xətilə xalı xəyalə,
Gedər fərağı könüldən, gəlir vüsalı xəyalə.

Könül, bu növ ilə könlün xoş eyləməkdi xəyalı,
Cinundumu, yoxsa, götürsə belə mahalı xəyalə?

Nəsihət eyləmə, naseh, özün də münsif olub, gör,
Zəmanə içrə gəlirmi onun misalı xəyalə?

Zəif təndə dil eylər xəyali-vəslini hər dəm,
Fələk salıbdı müqabil əcəb xəyalı xəyalə.

Firiştəçöhrə nigara, əgərçi şikvə yoxumdur,
Vəli, nolur salasan bir bu xəstəhalı xəyalə.

Axar sirişk gözümdən, düşər əyağə dəmadəm,
Yetəndə ol ləbi-ləlin meyi-zülalı xəyalə.

Kaman kimi olur qəddim xəmidə, ey siyahəbru,
Düşəndə hər dəm ol sərvqədin nihalı xəyalə.

Kəməndi-zülfünə düşdüm, əsiriyəm, dəxi gəlməz
Nə izzü cahı cahanın, nə mülkü malı xəyalə.

Zibəs ki, möhnətə mötad olubdu Yusifi-miskin,
Yetişməyir dəxi görməklik ehtimalı xəyalə.



Çeşmü dilimdə bax, həzər et, əşkü ahimə,
Ey şanə, dəymə həlqeyi-zülfi-siyahimə.

Bir eylə rəhnəvərd deyiləm ki, eşqdə
Yetməz səməndi-seyri-cinun gərdi-rahimə.

Ətfali-ruzigar təqib edib bəni,
Hər gün düşər dalımca, nəzər qıl sipahimə.

Döndərrəm əbri-ahilə zülmatə yer üzün,
Xurşid çərxi-mehrin əgər salsa mahimə.





Dilbəri-bimehr vəslindən cüda istər məni.
Yarə bax, əğyarlərlə aşina istər məni.

Verməz ol ləbdən mənə düşnam, lütfün kam qılıb,
Təşneyi-sərçeşmeyi-abi-bəqa istər məni.

Ol pəri hər sübhdəm zülfün pərişan etməyin
Sirri var, sərgəştə, çün badi-səba, istər məni.

Lalərəng etdi tənim əbruləri eşqində əşk,
Eyddir çün ol sənən gülgün qəba istər məni.

Ney tək əfqan etmə, Yusif, hər qərəzdən xali ol,
Mən nəvanı neylərəm, çün binəva istər məni.

Könlümün bağında vardır sərbi-qəddin sayəsi,
Əşki-çeşmin cuyibarıdır onun sərmayəsi.

Feyzi-ruhilqüdsdən İsi-ibn-Məryəm tapdı ruh,
Ruhi-İsadır bu ətfali-yetimin dayəsi.

Ruh əgər olmazsa, tapmaz bir cəsəd feyzi-həyat,
Hüsn əgər olmazsa, məlum olmaz eşqin payəsi.

Badədəndir məstlik, amma o ləli-abdar
Şahidi-məna bu keyfiyyətdə Quran ayəsi.

Yusifa, hərçənd şirindir kəlami-abdar,
Eşqi-xubandır ərus, fikr tək pirayəsi.



Edəndə zülfünə məşşatə, qaldı şanə yeri.
Bu şərhə-şərhə könüldən qalıb nişanə yeri.

Bu can sənindir, əgər istəsən qələm təslim,
Nigah edib mənə hər ləhzə ahuvanə yeri.

Könül tapıbdı səni, məst olur, özün bilməz
Tapanda müflisi-biçarə bir xəzanə yeri.

Murad əgər dilü din olsa, etmişəm nəqdim,
O şux üçün dəxi qalmıbdı bir bəhanə yeri.

Üzündə xalına müştaq olubdu, əl çəkməz,
Tapıb könül quşu bir tazə abü danə yeri.

Açıldı bağdə güllər, nə yatmısan, bülbül,
Bahar mövsümü, gül fəslidir təranə yeri.

Xəyali-qeyri ilə yaxşı tapmısan, zahid,
İnanma kim, ola minbər kimi fəsanə yeri.

Məhəbbətin dili-aşiqdə, məscidə getməz,
Rəva deyil ola məscid şərabxanə yeri.

Bahar gəldi, çəmən vəqtidir, gəl, ey Yusif,
Var indi bir qəzəli-şuxi-aşiqanə yeri.



Ey cənnət iştiyaqi camalın nəzarəti,
Niyran əzabı nari-fərağın hərarəti.

Vəsfi-rüxündə xəlq olunub ləzzəti-behişt,
Hicrində var şərari-cəhənnəm sərarəti.

Çeşmin qərası qanımı firva verir mənim,
Əbrulərin həlakıma eylər işarəti.

Bir guşə kəcnigah eləyib aldı canımı,
Can almağa o çeşmin əcəb var məharəti.

Qalmaz cahanda bir nəfər üşşaqdən nişan,
Bu noi sən ki, başlamısan qətlü qarəti.

Çox cəhd qılma cismim əlacında, ey təbib,
Mümkün deyil bu mülki-xərabın imarəti.

Etdi o gün ki, mərifətin badəsin haram,
Bağlandı zahidin o zamandan bəsarəti.

Könlündə var vüsal təmənnası Yusifin,
Bilməm nə cürət ilə edər bu cəsarəti.



Barilahi, ələmi-eşqilə yar eylə məni.
Qəmü ənduhi-məhəbbətlə fikar eylə məni.

Eşq ənduhi ilə könlümə ver zövqü səfa,
Qəmi-canan ilə sərməstü xumar eylə məni.

Xali etmə qədəhi-aşiqi meydən bir dəm,
Yəni çox dərdü qəmi-eşqə düçar eylə məni.

Öylə məmlüvv elə bu cismimi qəmdən ki, baxan
Görməsin məndə məni, böylə nizar eylə məni.

Onu kim sən də sevərsən, məni də qıl rağib,
Onu kim, sevməsən, ondan da kənar eylə məni.

Gülşəni-qeyrdə yüz gül ola mail deyiləm,
Çəməni-eşqü məhəbbətdə həzar eylə məni.

Yusifəm, əbdi-dərü xaki-rəhindən məhsub
Eyləmə, itlərin əddində şümar eylə məni.





Xuramə gəldi nigarın o sərü balasi,
Müşəxxəs oldi behiştin nihali-Tubasi.

Təkəllüm eylədi kövsər bilindi kim nə imiş,
Üzün açanda açıldı behişt mənasi.

Məhəbbət əhli bəla istəyib cəfayə dözər,
Həmişə çün budur aşiqin təğazasi.

Həqiqət aşiq olur aşiqi-cəmali-nigar
Ki, hərgiz olmaya məşuqdən təmənnasi.

Atar kənarə diyari-vəfada min aşiq,
Gələndə mövcə bu aləmdə eşq dəryasi.

Vüsal vəqti rüxi-yarə eylə nəzzarə,
Bəhardə xoş olur gülsitan təmaşasi.

Tənəttüq eylədi bir növ ilə ki, məst etdi
Təmam xəlqi "şərabən-təhur" səhbasi.

Əgər ki, talibi-işraqsən, günəş birdir,
Olursa hər bir üfüqdən onun təcəllasi.

Təlatüm eyləsə gər bəhri-mərifət, Yusif,
Nə kuhi-Tur, nə Musa qalır, nə Sinasi.



İstəsən olmağa mətlubi-zərü sim kimi,
Safü pakizədil ol, çeşməyi-təsnim kimi.

Mənbeyi-müttəsil ol, feyz yetir dünyayə,
Xəlqə rövşənlik üçün vasitə ol sim kimi.

Baxma xəlqin sözünə, cəhd elə öz əqlinə bax,
Sındırıb bütləri tərk eylə Bərahim kimi.

Məhfili-ünsdə şərh et ləbi-canan vəsfin,
Nə ki bir guşədə ləbbəstə otur "mim" kimi.

Aç müfəssəl deginən mətləbi məxluqə əyan,
Ruh ver məqsədinə sureyi-"Ha-mim" kimi.

Nəf' ver aləmə səy et, hərəkət eylə müdam,
Dayanıb gözləmə divardə təqvim kimi.

Qane ol, əhli-qənaət olur aləmdə əziz,
Hiç bir rütbə deyil rütbeyi-təslim kimi.

Ey həris, eyləmə bu qədri təfəkkür, tutalım
Şahsən, məmləkətin var idi İqlim kimi.

Zahida, mən rəhi-meyxanə tutum, sən məscid,
Görəlim aqibətində aparır kim kimi.

Yıxma hər xanəxərabın evini zöhdünlə,
Tutma hər bixirədi kəlmeyi-təxfim kimi.

Yusifa, şərtdir arayişi-təmkilini qar,
Hər zaman olma açıq dəftəri-təlim kimi.



Gülbərgi-tər ləbindən alıbdır nəzafəti,
Xurşidə mah arizin eylər izafəti.

Ruxsarına deyibdilər Xurşiddir, vəli
Yerdən bu mətləbin göyəcən var məsafəti.

Qaşın qılınc gücilə tutub külli-aləmi,
Eylər səriri-səltənət üstə xilafəti.

Müjganlarında təbiyədir bir cahan bəla,
Çeşmində məhvdir iki dünyanın afəti.

Əbrulərin şəbihdir mehrabi-Kəbədə,
Vəchi budur ki, Kəbənin artıb şərafəti.

Zülfi-siyahü arizi-alından, ey pəri,
Kəsb etdi mişk rayihəni, gül lətafəti.

Yusifdən ülfətin kəsəcəksən eşitmişəm,
Ey məh, amandı, eyləmə böylə zərafəti.





Hər kim cahanda ləblərinin oldu şaiqi,
Kəşf eylədi nəkatü rümuzü dəqaiqi.

Dil bağlayan iradət ilə qeydi-zülfünə,
Qət eylədi cəmiyi-qiyudü əlayiqi.

Zülfün çıxartdı rayihəsi mişki yaddən,
Mənsux qıldi ləli-ləbin şəhdi-naiqi.

Saldı cahanə fitnəvü aşub gözlərin,
Əbrulərin keçirtdi qılıncdan xəlayiqi.

Gəh dağə saldı, gah girib bağə bağladı
Ləlin dəhani qönçəni, çeşmin şəqaiqi.

Şanə dəyəndə zülfünə könlüm olur xərab,
Zülfünlə könlümün budu var aşinaliqi.

Yusif üzari-alın ilən məhcəmalının
Bir kəmtərin qulamıdı, gər olsa layiqi.





Ta camalın rütbəsin, ey şux, idrak eylədi,
Rəşkdən gülşəndə gül pirahənin çak eylədi.

Ləlinin ta qönçeyi-noxiz tək rəngin görüb
Arizuyi-söhbətin duşin zeyi-tak eylədi.

Nuri-hüsnü afəti-çeşmü xəmi-əbru ilə
Yer üzün ruxsari-pakın rəşki-əflak eylədi.

Əşkim ol gündən gözümdən düşdü kim seylan edib
Tutiyayi-xaki-payin didədən pak eylədi.

Könlüm ol gündən mənə düşməndi kim, səndən səva
Gül təmaşası onu gördüm fərəhnak eylədi.

Olmasaydı vəslin, öldürmüşdü hicranın məni,
Səmmi-hicri zövqi-vəslin məhz tiryak eylədi.

Yusifin, ta kim yetirsin kuyinə badi-səba,
Atəşi-eşqin, vücudun yandırıb xak eylədi.





Düşübdür eşqə könül, eşqdən kənar ola bilməz.
Bu eşq aləmi tək türfə laləzar ola bilməz.

Zamanı tazə bəhar etdi hüsnü xəttilə ol mah,
Cahanda bir gül ilə kim deyir bahar ola bilməz?

Behiştü huriyə məşğuldur xəyal ilə zahid,
Əmiri-silsileyi-zülfi-tabdar ola bilməz.

Təəşşüq əhli bilir rəmzi-eşqi, özgə nə bilsin,
O dami-zülfü görən olmasın, şüar ola bilməz.

Görəndə dilbərini biqərar olur dili-aşiq,
Qərarü səbri gedər, əldə ixtiyar ola bilməz.

Nihan qala bu sirişk ilə sirri-eşq çətindir,
Əgər ki, məst olana daim etibar ola bilməz.

Cəmii-xəlq cəhalətdən ayılır yenə, Yusif,
Təkəbbür aləminin məsti huşyar ola bilməz.





Əgər eşq olmasa, şeydalıq olmaz,
Əgər göz olmasa, binalıq olmaz.

Əgər hüsn olmasa, olmaz təəşşüq,
Səri-bazardə rüsvalıq olmaz.

Bu rüsvalıq təəşşüqdən əsərdir,
Təəşşüq olmasa, peydalıq olmaz.

Bu tövlidə tənasül eşqdəndir,
Tənasül olmasa, zibalıq olmaz.

Məhəbbətdəndir icadü təkəvvün,
O olmazsa, bu ruhəfzalıq olmaz.

Cahanın illəti, qayəsidir eşq,
Bu olmazsa, bütün dünyalıq olmaz.

Nə hüsn olmaz, nə eşq olmaz, nə dünya,
Nə bir Yusif, nə Əbdülxalıq olmaz.





Gəldi bahar, gəlmədi ol nobaharımız,
Açıldı gül, açılmadı ol gülüzarımız.

Güllər çıxıb, tərənnümə gəldi həzarələr,
Bilməm nə var ki, naləyə gəlməz həzarımız.

Hər lalə bir piyalə tutubdur, nədir səbəb
Gülşəndə bir piyalə götürməz nigarımız.

Gəl, ey məhəbbət əhlinin aramü taqəti,
Gəl, ey bizim məsərrətimiz, nazlı yarımız.

Sənsiz çəməndə zövqi-vüsalın nə ləzzəti,
Sənsən bizim bəşaşətimiz, iftixarımız.

Bir gəl açıl bu bəzmdə, ey gül ki, qalmadı
Aramü tabü taqətü səbrü qərarımız.

Sən olmasan nə eyşimiz olsun, nə nuşimiz,
Sən olmasan nə mey ola, nə meygüsarımız.

Sənsiz bizim nə camımız olsun, nə badəmiz,
Sənsiz bizim nə cəngimiz olsun, nə tarımız.

Yusif, məhəbbət əhlinə canlar nisar qıl,
Sənsən əgər bu aləm ara cannisarımız.



Rəhi-məşuqədə getdi hamı dünyalığımız.
Hamıya oldu əyan aşiqi-şeydalığımız.

Qəmi-sədsalədən azad olan əmvatləriz,
Meyi-nohsalə iləndir bizim əhyalığımız.

Səri-bazardə rüsvalığımız təbli əgər
Vurulubsa nə əcəb, fəxrdi rüsvalığımız.

Meyü məşuqədən özgə bizə lazım deyil heç,
Bilinir olsa əgər qeyri-təmənnalığımız.

Nə bilür bir neçə qal əhli bizim halımızı,
Çünki surətdə deyil surəti-mənalığımız.

Simü zər zahidə verdik, dilü din canana,
Nə bu dünyalığımız var, nə o dünyalığımız.

Yetişib Yusifə, zahid, demə dünya qəmini,
Yetər üqbadə görək kim, nə edər Xalığımız.





Kəməndi-eşqdə məhkum olan dünyayə bənd olmaz.
O kim dünya sevər, eşq anlamaz, bəndi-kəmənd olmaz.

Şəbandır xəlq üçün sultan, gərək kim yatmasın rahət,
Pərəndü pərniyan pərvərdəsi sahibpərənd olmaz.

Tərəqqi elmiləndir, elm üçün əxlaq lazımdır,
Nihali-sərv su içməzsə hərgiz sərbülənd olmaz.

Tərəqqi ittihad istər, tərəqqi ittifaq istər,
Tərəqqi ictima istər, tərəqqi çunü çənd olmaz.

Təməddün dəhrdə əxlaqsız bir cismi-bicandır,
Təni-biruh yüz ziba olursa dilpəsənd olmaz.

Əgər bir məmləkət abad ola, sakinləri zalım,
Yəqin ol məmləkətdən cinsi-insan bəhrəmənd olmaz.

Lətafət, mərifət hər yerdə müstəhsəndir, ey Yusif,
Vəli, dəstar çirkin olmasa əbləhpəsənd olmaz.

Yetər, əhalinin şərhinə sən ayinəbənd olma,
Özü öz fəhminə məğrur olan müştaqi-pənd olmaz.



Eşq olmasa fikri-ləbi-canan gözə gəlməz,
Eşq aləmi bir möhlikədir, can gözə gəlməz.

Gün gülməsə, əbr ağlamasa, gülşən ayılmaz,
Arayişi-gülzarü gülüstan gözə gəlməz.

Zülfi-siyəhü arizi-gülrəngdən özgə
Gülşəndə gülü sünbülü reyhan gözə gəlməz.

Hərçənd ləbin nisbəti var rəngdə lələ,
Nitq eyləsə ləb, ləli-Bədəxşan gözə gəlməz.

Hüzn ilə fərəh, rəncilə rahət iki zaddır,
Cəmiyyəti-dil zülfi-pərişan gözə gəlməz.

Zülmat əgər olmasa, ey puri-Skəndər,
Sən eylə yəqin çeşmeyi-heyvan gözə gəlməz.

Zövqü fərəhi-sübhi-vüsalın o qədərdir
Kim, rəncü ənayi-şəbi-hicran gözə gəlməz.

Yusif, gecə olmazsa günüz qədri bilinməz,
Cəhl olmasa, keyfiyyəti-ürfan gözə gəlməz.

Nadanlar əlindən bu qədər eyləmə şikvə,
Heyvanlar əgər olmasa, insan gözə gəlməz.



Düşən sövdayi-zülfi-yarə fəryadü nəva çəkməz,
Məhəbbət qeydinə hər kim ki, pabənd oldu, pa çəkməz.

Tapılmaz bir nəfər, gör bir cahanda hansı aşiqdir
Ki, fikrü qüssəvü rəncü qəmü dərdü bəla çəkməz..

O hansı binəva eşq əhlidir bu dari-dünyada
Ki, daği-firqəti-məşuq ona dəsti-qəza çəkməz.

Deyil rövşəndil ol bidərd kim, aləmdə dildarın
Qübari-rahini göz mərdümünə tutiya çəkməz.

Əgər eşq əhlisən daim bəla çək, rahət axtarma
Ki, dərdi-eşqdən bimar olan qeydi-dəva çəkməz.

Nə qəm gəlsə qəzadən qane ol, qəm çəkmə, biqeyd ol,
Qənaət Qafının Ənqası qayğuyi-qəba çəkməz.

Bu aləm aləmi-laqeydlikdir, yaxşı aləmdir
Ki, xubü zişti birdir, şahdən minnət gəda çəkməz.

Vurubsan çünki lafi-eşq, bəs amadə ol, Yusif
Ki, çəksən sən çəkərsən bu yükü, səndən səva çəkməz.



O məhru könlümün qəmdən pərişan olduğun bilməz,
Cəfa rəsmin bilir, amma cigər qan olduğun bilməz.

Könül xorsənddir kim, ol nigar əhdi-vüsal etmiş,
Vəleykən sonra əhdində peşiman olduğun bilməz.

Çəməndə sərv boy çəkmiş, vurar dəm qəddü qamətdən,
Zəhi, qafil ki, bu sərvin xuraman olduğun bilməz.

Ləbinlə eyləyər dəvayi-nahəq ləli-rümmani,
Olur vazeh ki, bu ləlin dürəfşan olduğun bilməz.

Ləbin kim abi-heyvandır, məni mən eyləyər ondan,
Necə adəmdi bu zahid ki, heyvan olduğun bilməz?

Nəsihət eyləyər naseh ki, Yusif, sirri faş etmə,
Dəxi hicran ara dərdin firavan olduğun bilməz.





Ey könül, bu aləm içrə bixəyal olmaq gərək.
Payibəndi-dami-zülfü xəttü xal olmaq gərək.

Çəkməmək can fikrini, çəkmək gərək canan qəmin,
Fikri-vəslilə o mahın bir hilal olmaq gərək.

Düşməmişdən hicri-yarə, çəkmək olmaz dərdi-hicr,
Şakiri-əyyamü didari-vüsal olmaq gərək.

Eşq bazarında kasiddir mətai-əqlü huş,
Az bu yerdə talibi-əqlü kəmal olmaq gərək.

Fikri-canandan səva çəkmək xilafi-eşqdir,
Tabe ki, pabəndi-fikri-mülkü mal olmaq gərək.

Eyləmək mümkün deyil zor ilə təhsili-mura,
İntizari-fürsətü vəqtü macal olmaq gərək.

Çün qübar aludə qılmaq canda qəlb ayinəsin,
Dərdü qüssəylə əbəsdir biməlal olmaq gərək.

Yusifa, yoxdur kəmalü mərifət talibləri,
Qeylü qal etmək nə lazım, əhli-hal olmaq gərək.

Hər mətai öz xiridarına satmaq yaxşıdır,
Çünki gördün yoxdu söz miqdarı, lal olmaq gərək.



Cəhd qıl rövşəndil ol, mərdandili-agah tək,
Ver işıq hər ruzü şəb dünyayə mehrü mah tək.

Şir tək qıl həmlə hər dəm dərdü qəm əfvacinə,
Qaçma meydani-bəlavü dərddən rubah tək.

Zülmdən, bidaddən mehrü məhəbbət yaxşıdır,
Cövr qılma, payimal ol, həlqeyi-xakrak tək.

Ol mələk zülmündən əfzəldİr, məbadə, eyləmə
Bir kəsə cövrü əziyyət mərdümi-gümrah tək.

Hər zaman gördün ki, cahü mənsəbin var, qıl həzər,
Tez tənəzzül verdirən olmaz ülüvvi-cah tək.

Cəhd qıl ta kim, fərahim gəlməsin əsbabi-zülm,
Yoxsa seylin tutmaq olmaz barişi-nagah tək.

Qafil olma iqtizaati-qəzadən, zinhar,
Kəhrəba cəzzab, sən məczubi-sirri-gah tək.

Nagüvaradır tamam əmali-əfalın sənin,
Vəsl əyyamında üşşaqə şəbi-kütah tək.

Ey qəni, qıl binəvalar əşkü ahından həzər,
Tündraq, tez yandıran olmaz bu bərqi-ah tək.

Təxtü taci-səltənət fikrində olma, ey fəqir,
Sanki, çıxdın sən də bir gün təxtə Əhməd şah tək.

Yusifin, diltəng olma, sözlərindən, ey könül,
Başdadır bu pəndlər hər yerdə "bismillah" tək.



Səni göz mərdümündə istərəm, ey məh, ziyalar tək.
Nola çəksəm gözümə xaki-rahin tutiyalar tək?

Qübari-rahini hər yerdə axtarram, qəmim yoxdur,
Əgər düşsəm ayaq altında qalsam buriyalar tək.

Qəra zülfün görüb avareyi-dəşti-cinun oldum,
Səri-kuyin deyib hər xakə üz vurram səbalar tək.

Xəbər tutmaz mənim, hər bixəbər, əhvali-zarımdan
Ki, hər bir pərdədə məxfiyü məsturəm sədalar tək.

Məni məczub edən eşqindir aləmdə ki, hər adəm
Səni məndən görər ayineyi-insannümalar tək.

Təəccüb eyləməz sirri-ləbin təşnis edən bəndə,
Əlaci-illəti-hər dərdmənd olsam dəvalar tək.

Könüllərdən sorağın tutmuşam, ey məh, əcəb sanma
Ki, hər ahəndili cəzb eylərəm ahənrübalar tək.

Gəlir avazi-eşqin gər kəsilsəm bənd-bəndimdən,
Fəğanü nalədən ayrılmaram, neydən nəvalar tək.

Şəhi-İqlimi-hüsnü Yusifi-Misri-məlahətsən,
Nola dursam qapında ərzi-hal etsəm gədalar tək?



Hər kəlmə ki, xoşdur, onu, ey dust, rəvan bil.
Hər pir ki eşq əhli ola, ani cavan bil.

Hər elm ki, məlumə yetişdirdi, odur elm,
Hansı ki, uzaq saldı, onu afəti-can bil.

Asarı göyərtməkliyidir badi-baharın,
Hər yel ki, qurutdu, onu sən badi-xəzan bil.

Təşbih edib oxşatma gülən hər ləbi lələ,
Rəmzi-süxəni dərk elə, əsrari-nihan bil.

Hər bir sözü hər yerdə danışma, demə hərgiz,
İdraki-məqam eylə, təqazayi-məkan bil.

Sidq əhli deyər sidqini, hərgiz qəsəm etməz,
Hər kim sözü and ilə inandırdı, yalan bil.

Hər mətləbi mənidən alıb hifz elə daim,
Təhsili-kəmalat elə, xasiyyəti-kan bil.

Hər bir şəcəri meyvəsi ilə tanıyarlar,
Şəxsi əməlilə, bu sözü faşü əyan bil.

Novruzdə hər nəxl ki, səbz olmadı, göz çək,
Hər nəxl ki, səbz oldu, onu nəxli-cinan bil.

Zahid sözü gər yaxşı isə, fikri yamandır,
Təşxisi-kəlam anlaginən, yaxşı-yaman bil.

Mənidir ərəz, surətə baxma, əsərin gör,
Gül yarpağı gər möhlük ola, ani ilan bil.

Məhsus ilə məquli tanı, fərz elə kim, eşq
Hərçənd nihandır, əsərin ahü fəğan bil.

Can əksik olur artdıqca tən, bunu bil sən,
Sərfi nədə var, sən onu tut sudü ziyan bil.

Eşq aləminin seyri xətərnakdı, Yusif,
Tiri-müjədən xof elə, əbrunu kaman bil.





Haralarə tutub zülfi gülizardə bir gül.
Yəni gözə görsənmədi kim, yardə bir gül.

Gördüm qədü balasını, göftarın eşitdim.
Rəftardə bir sərvdi, göftardə bir gül.

Bir yar ilə bu rəsmdi kim, bağlanır güllər,
Kim gördü ki, bağlansın iki tardə bir gül.

Ahıl deyiləm yari-nəs məndə gül eylər,
İki gül olur səfheyi-ruxsardə bir gül.

Baxdım xətü ruyində görüb həlqeyi-zülfün,
Sandım çəmən içrə dəhəni-mardə bir gül.

Açıldı gəlib güldü çəməndə hamı güllər,
Bir sən də açıl, gül, səri-bazardə bir gül.

Yusifdə qəzəl, cam dolu bəzmdə mina,
Bir töhfədi dərvişi-diləfkardə bir gül.





Kənari-cuybari-xaki-eşqə payibənd  oldum.
Odur kim, sərv tək bu aləm içrə sərbülənd oldum.

Qübari-rah tək üftadəlik rəsmin şüar etdim,
Səvadi-sürmeyi-çeşmi-dili-hər huşmənd oldum.

Təhəmmüllər qılıb acı sözə, incitmədim bir dil,
Bu üzdən dilnişinü dilrübavü dilpəsənd oldum.

Zəlilü zar olub xari-rəhi-xəlq olmadım hərgiz,
Odur hər bəzmdə gül tək əzizü ərcümənd oldum.

Riyasız, biqərəz, nasehlərin pəndin qəbul etdim,
Təşəxxüs satmadım, kibr etmədim, müştaqi-pənd oldum.

Əgər bilmək dilərsən, bilməməzlik ixtiyar eylə
Ki, mən də bilmədim ki, aqibət bildim bülənd oldum.

Kəməndi-zülfi-yarı rişteyi-can gördüm, ey Yusif,
Tapıb sərriştəni, canlar verib bəndi-kəmənd oldum.





Keçən gün bir büti-ziba camalın durdən gördüm.
Sərasər qaməti guya yaranmış nurdən, gördüm.

Məhi-rüxsarını xurşid sandım əbri-zülf içrə,
Təni-simin səfasın saftər büllurdən gördüm.

Dəhani-dürfəşanını gördüm qönçeyi-gül tək,
Miyani-nazikin bariktər zünnurdən gördüm.

Qiyamət qamətin, aşubi-çeşmin fitnə müjganın,
Kəlamın bir əlamət yövmi-nəxfi-surdən gördüm.

Salıbdır xəlq ara aşub, ancaq bir nigah ilə,
Xəlayiq fitnəsin ol nərgisi-məxmurdən gördüm.

Olundu şöləvar eşq atəşi sinayi-sinəmdən,
Təcəllayi-camalın ta fərazi-turdən gördüm.

Edib zahir cahanda, Yusifa, bir məhvəşi-kübra,
Cahan aşubini ol ləbi-pürşurdən gördüm.





Şəbi-hicran gözümü maili-xab eyləmişəm.
Bu nə işdir ki, məni-xanəxərab eyləmişəm?

Ruzi-məhşərdə mənə daxi verirlər nə əzab,
Fəsli-gülzardə tərki-meyi-nab eyləmişəm.

Dəhənin sirrini söz yox ki, nihan etməlidir,
Mən onu şərh edib aləmdə kitab eyləmişəm.

Əşkdir ahım ilə, badə deyil, qanlı sirişk
Tökübən camdə tərtibi-hübab eyləmişəm.

Qanlı yaşım olur rüxsarıma, əlbəttə, rəvan,
Ləbin əyyamını mən sərdi-şərab eyləmişəm.

Atəşi-dildə, üzün fikri, sirişkimdi mənim,
Gülü ənbər ilə gör bir nə gülab eyləmişəm.

Bisütundan mənə Fərhad deyər "səd əhsən",
Ondan ötrü ki, sənin hicrinə tab eyləmişəm.

Meyi-gülfamı tökübü sağərə, verdim nəzərə,
Bax bu keyfiyyətə, gör atəşi ab eyləmişəm.

Didə canan üzünü görmək üçünmüş, Yusif,
Mən onu badəvü peymanə hesab eyləmişəm.



Şəmdən başqası əhvalıma yanmaz mənim.
Bu da bir qəm ki, qəmim kimsə inanmaz mənim.

Qəm zamanında nə qədri baxaram, bir qəmxar
Dudi-ahım kimi bir kimsə dolanmaz mənim.

Etdiyim ahü fəğanımdan əcəb kim, şəbü ruz
Xəlq usandı, nə üçün könlüm usanmaz mənim.

Yetişib göylərə ahım şərəri fəsli-bahar,
Bərqi-barandı gözüm yaşı, dayanmaz, mənim.

Xəlq oyandı, gecə sübh oldu, işıqlandı cahan,
Bu əcəbdir ki, yatan bəxtim oyanmaz mənim.

Könlümün lüccəsi əzbəs doludur, xəlqi-cahan
Tənələr daşı nə qədr atsa, bulanmaz, mənim.

Tökmə, Yusif, gecə-gündüz üzünə qanlı sirişk,
Fikrimin bağı bu nəhr ilə sulanmaz mənim.





Dildən, deyərdilər, aparar camü badə qəm.
Əfsus verdi ömrümü dünyada badə qəm.

Görcək məni minər, mənə çox iştiyaqı var,
Guya ki, müntəzirdi mənimçün həvadə qəm.

Cam içrə qəm, çəməndə qəm, ətrafi-canda qəm,
Qürbətdə qəm, vətəndə qəm, ərzü səmadə qəm.

Hər bir tərəf dolansam olur qəm müqabilim,
Məmlüvvdür bu ərsəyi-möhnətfəzadə qəm.

Həddən ziyadə könlümü şad etdi qəmləri,
Çünki verir fərəh dilə həddən ziyadə qəm.

Şah olsa mat, qəm verir onda vəzirə rüx,
Fərzin olursa, şah tək etməz piyadə qəm.

Ol mahi-mehriban ona bir "mərhəba" demiş,
Etməz cahanda Yusif Yəqubzadə qəm.





Canlar verib axır ləbi-canana yetişdim,
Amma yetişincə o gülə, canə yetişdim.

Qandım ki, Məsiha ləbidir, verdim anə can,
Ondan ki, mənə can veriyor, anə yetişdim.

Hicran çəkib ol mahrüxün vəslinə yetdim,
Duzəxdən ötüb cənnəti-rizvanə yetişdim.

Feyzi-ləbi-Xızr eylər ikən mürdəni zində,
Mən zində ləbi-çeşmeyi-heyvanə yetişdim.

Aqil sitəmi-firqət üçün fikr eləyincə,
Vəsli-ləbi-yarə məni-divanə yetişdim.

Cəmiyyəti-xatirdən əzəl dəfədə keçdim,
Tainki səri-zülfi-pərişanə yetişdim.

Yəqubsifət ağladım ol qədri cahanda
Kim, aqibət ol Yusifi-Kənanə yetişdim.





Hicri-zülfündə zibəs naləvü əfqan etdim,
Aləmi ahü fəğanımla pərişan etdim.

Baxmadım qönçəyə fikri-ləbi-ləlinlə sənin,
Könlümü aləm ara qönçə kimi qan etdim.

Tutdu dünya üzünü qanlı sirişkim, ey gül,
Sərbəsər kuyi-cahanı güli-xəndan etdim.

Bəsləməkdən ötəri didədə bir sən təki dürr,
Sədəf etdim gözümü, əşkimi ümman etdim.

Söhbəti-zülfü rüxü xalü xətü hüsnün ilə
Sərbəsər məclisi-üşşaqi çirağan etdim.

Tapmadım bircə mətai ki, səzavarın ola,
Aqibət canımı bu rahdə qurban etdim.

Bəs ki, bülbül kimi əfqan elədim, ey Yusif,
Aləmi bir gülün eşqində qəzəlxan etdim.





Görüb gül cəmalını, ey məh, qərardən düşdüm.
Kəsildi tabü təvan, ixtiyardən düşdüm.

Təni-zəifimlə tədric ilə ol müjganın
Xədəngi-kargər olduqca, kardən düşdüm.

Sənə könül verəli getdi hörmətim əldən,
Bu xəlqi-aləm ara etibardən düşdüm.

Günüm qəra elədi qarə günlərin fikri,
Bu ruzigarə o çeşmi-xumardən düşdüm.

Vüsal qədrini bilmib, düçari-hicr oldum,
Bu qəmli bəstərə mən intizardən düşdüm.

Düşəndə silsileyi-əhli-eşqə, ey Yusif,
Tutub ol silsileyi-tabdardən, düşdüm.





Əzizim, nuri-eynim, sən mənim ruhi-rəvanımsan.
Könüldə behcətim, ünsiyyətim, cismimdə canımsan.

Sənin əltafünü dildən fəramuş etməzəm, hərgiz,
Ənisim, munisimsən, məhrəmi-razi-nihanımsan.

Səniləndir həmişə söhbətim, fikrü xəyalatım,
Yadımdan çıxmazsan, fikri-dilim, virdi-zəbanımsan.

Xəyalınla ənisəm, fitrətinlə munisəm hər gün,
Gülümsən, bülbülümsən, gülşənimsən, gülsitanımsan.

Sənin məktubi-mərğubun mənə can verdi vaiqdə,
Həmanha ruhpərvərsən, məsihayi-zəmanımsan.

Müniri tək deyilsən, mehribansan, mehrpərvərsən,
Müinsən, möhtərəmsən, məhliqasan, mehribanımsan.

Mülazi mülcayim, qəsrü məkanım, mədəni-kanım,
Məramü məqsədim, taci-sərim, darülamanımsan.

Xəyali-fikrəti-şövqi-səri-pürşur məstimsən,
Süruri-behcəti-zövqi-dilqəm təvanımsan.

Soruşdun Yusifi-gümgəştənin əhvali-övzain,
Mənim Yəqubi-əsrimsən, mənim piri-muğanımsan.



Çünki elədin lütf ilə, ey yar, təkəllüm,
Lütfün ola əfzun, elə təkrar təkəllüm.

Bazarı dəxi şəkkərü qəndin olur kasid,
Gər eyləsə ol ləli-şəkərbar təkəllüm.

Tuti bu lətafətdə məqalın görə hərgiz,
Etməz, şəkəristan deyib, izhar təkəllüm.

Bu nüktəni bilmib dəhənin yox dedi zahid,
İnkar edə bilməz, nə üçün, var təkəllüm.

Öylə dəhənin təngdi kim, nitqə gələndə
Eylər sənə bir növ ilə azar təkəllüm.

Bülbül kimi əfğanə gəl, ey qəmzədə Yusif,
Gül kimi edər çün ləbi-dildar təkəllüm.

Sən Baküdə, Bağdaddə məşhur Füzuli,
Məlum olur gər olsa xiridar, təkəllüm.





Sirri-eşqi demək olsaydı, nihan etməz idim.
Dəxi gizlin bu qədər ahü fəğan etməz idim.

Göz yaşın saxlamaq olsaydı, kəsərdim, gizlin
Dəxi ruxsarıma isrədi-rəvan etməz idim.

Dözmək olsaydı əgər dərdü qəmi-hicranə,
Gizlədərdim, onu xəlq içrə əyan etməz idim.

Hasil olsaydı əgər qeyrilə cəmiyyəti-dil,
O səri-zülfi-pərişanda məkan etməz idim.

Dolmasın əşk ilə çeşmim edə bilsəydim əgər,
Özümü boş yerə rüsvayi-cahan etməz idim.

Baxa bilsəydim əgər qönçəyə sənsiz, bu qədər
Fikri-ləlinlə dəxi bağrımı qan etməz idim.

Gördün axırda rəva kim, ciyərim qan olsun,
Səni, ey qönçədəhan, böylə güman etməz idim.

Bilməsəydim var əgər tiri-səlamət, Yusif,
Könlümü talibi-əbruyi-kəman etməz idim.



Xoş ol günlər ki mən hər dildə mehrəfzalıq istərdim,
Gülüstani-cahanda gül kimi rənalıq istərdim.

Sevərdim qönçə tək açılmağı hər bir çəmən içrə,
Xoş ol günlər ki, mən güllər sevib şeydalıq istərdim.

Çəkərdim çeşmimə köhlül-bəsər tək xaki-əhbabi,
Bu təqrib ilə hərdəm didəmə binalıq istərdim.

Mürəkkəb tək gəzib hər kağız üstə ərzi-hal etmək,
Qələm tək durduğum yerdə cahanpeymalıq istərdim.

Səvadi-xətti-mişkin istəyib kağız misalında,
Rüxi-zibayi-hər məhbubdən zibalıq istərdim.

Səba, hərgah güzarın düşsə Bakü şəhrinə bir gün,
Mənim də bir nəfərdən var sözüm, cuyalıq istərdim.

Yolun bazardən düşsə, xəbər tut bir Kazım bəydən,
Onunçün mən həmişə o cür istiğnalıq istərdim.

De kim, ey həmdəmi-namehriban, ey mənşəyi-ürfan,
Səni ki, hamıdan mən xeyli, bir dünyalıq istərdim.

Sənin də yadına hərgiz düşərmi, zikr edərsənmi
Ki, mən də bir nəfər dünyada Əbdülxalıq istərdim.



Gərçi dün yetdi mənə ol meyi-minadan kəm.
Olmasın sağərin, ey müğbeçə, səhbadan kəm.

Ləbin ecazi məni-mürdəni ehya elədi,
Tutmaram mən onu ecazi-Məsihadan kəm.

Dürri-əşkilə cahanı elə, ey çeşm, qəni,
Qətəratilə nə bir şey olu dəryadan kəm.

“Ərəni” söylədi Musa, ona “Lən” gəldi cavab,
Özü öz rütbəsin etdi bu təmənnadan kəm.

Kuyi-dildarə qədəm basginən ahəstə, könül,
Ehtiyat et, bu deyil vadiyi-Sinadan kəm.

Tutduğuyçün əl atıb Yusifinin damənini,
Oldu gör bir nə qədər şən Züleyxadan kəm.

Xaki-rahi o şəhin Yusifə az oldu nəsib,
Ruzisi gəlmiş idi aləmi-baladan kəm.





Ey güli-tər, məni xar eyləmədinmi? Elədin!
Şöhreyi-xürdü kübar eyləmədinmi? Elədin!

Salmadınmı üzünə zülfi-siyahı? Saldın!
Günümü çün şəbi-tar eyləmədinmi? Elədin!

Almadınmı dili-sədparəmi əldən? Aldın!
Bir nigah ilə şikar eyləmədinmi? Elədin!

Olmadımmı səri-kuyində mücavir? Oldum!
Məni sən hicrə düçar eyləmədinmi? Elədin!

Nalə bülbül kimi eylər ikən, gül kimi sən
Xəndə, ey laləüzar, eyləmədinmi? Elədin!

Tutmadınmı gedib əğyar ilə ülfət? Tutdun!
Məni əğyar ilə yar eyləmədinmi? Elədin!

Dust, biganəni yox, aləmi, ey mahliqa,
Mənə düşmən, nə ki var, eyləmədinmi? Elədin!

Demədinmi ki, nigahımla səni qətl edərəm?
Mən ilə böylə qərar eyləmədinmi? Elədin!

Yusifi, ey güli-sədbərgi-məhəbbət, hər dəm
Gülşəni-eşqə həzar eyləmədinmi? Elədin!



Köhnələndikcə həqiqət meyi meyxanələrin,
Rəğbəti tazələnir badəyə məstanələrin.

Tazələndirdi cahanı yenə əyyami-bahar,
Sirrini kəşf elədi badi-səba danələrin.

Vəqt o vəqt oldu ki, dünyaya şəfa bəxş elədi
Lütfdən dürdi-şərabı, xümü peymanələrin.

Badə keyfiyyətini badə içəndən xəbər al,
Yolu yoxdur bu hərəmxanəyə biganələrin.

Eşq səhralarının mərhələ peymaları var,
Əqli çatmaz bu yerə aqilü fərzanələrin.

Dil təmənnayi-vüsal eyləməyincə, nə bilir
Şəmə yanmaqda nədir məqsədi pərvanələrin.

Sər verib, süfreyi-namərdə salam etmədilər,
Afərin himməti-valasına mərdanələrin.

Zülf sərgəştəliyin badi-səbadan xəbər al,
Mubəmu şərh eləməz, min dili var şanələrin.

Zülfdən söylədi Yusif yenə dincəlməyəcək
Hərəkət verməsə zəncirinə divanələrin.



Əqlü fərasətü huş etdi fərar məndən.
Yarım ol gün ki, çünki düşdü kənar məndən.

Könlümə ol zaman ki, mehrini ol mah saldı,
Getdi təvanü tabü səbrü qərar məndən.

Bəs ki, qəmində etdim ahü fəğanü nalə,
İnciyibdi əhli-aləm hər nə ki var, məndən.

Ol qədri oldu cismim zarü əlilü müztər
Kim, mütənəffir oldu xürdü kübar məndən.

Öylə sipahi-möhnət həmləbar oldu, hətta
Tən ilə üz çevirdi xişü təbar məndən.

Getdi vətən xəyalı, qürbətə mail oldum,
Müncəzir oldu bəs ki, əhli-diyar məndən.

Tökmə sirişki, ey çeşm, eyləmə nalə, ey dil,
İncinməsin ol yarı-laləüzar məndən.

Səhldir hər nə olsa dərdü müsibətü qəm,
Vay o gündən ki, incinə yar məndən.

Zillətü möhnətü qəm hər nə olursa-olsun,
İncinməsin cahanda tək ol nigar məndən.

Fəsli-bahar gəldi, güllər açıldı, Yusif,
Görmədi bir tərənnüm fəsli-bahar məndən.



Xurşidi-mey göründü sipehri-piyalədən,
Saqi, gözün fədası, çəmən doldu lalədən.

Tər qətrə-qətrə arizi-dildari qıldı zib,
Guya qızılgülün vərəqi tərdi jalədən.

Cami-bülurdən meyi-safi müayinə,
Qursi-qəmər kəmin mütəəssirdi halədən.

Mövsüm bahar mövsümü, güllər fərəhfəza,
Bülbüllər ixtiyarım alıb şurü nalədən.

Aləm, behişt aləmi, bexsus ki, nobahar,
Məmlüvvdür fəzayü zəmin alü alədən.

Tutmaq olurmu badeyi-gülrəngdən səva,
Dönmək olurmu saqiyi-mişkingülalədən.

Zahid, hənuz məsələdə iştibahı var,
Pak olmayıbdı indi də abi-qüsalədən.

Bilmibdi kim, zəmanədə bir zərrə mərifət
Məhbubədir ibadət həftadsalədən.

Yusif, cahanda get oxu eşqin risaləsin,
Həll oldu külli məsələlər bu risalədən.



Ey qönçədəhan, döndü könül qanə ləbindən.
Ta öpdü keçən gün ləbi-peymanə ləbindən.

Əmvata əgər can verə ləlin nola kim, Xızr
Yol tapdı ləbi-çeşmeyi-heyvanə, ləbindən.

Gülzarə girib naz ilə gər tənə dəmadəm
Vursan, yeri var, qönçeyi-xəndanə ləbindən.

Bir yerdə ki, saldı gül üzün laləni dağə,
Gör yetdi nələr ləli-Bədəxşanə, ləbindən.

Zəncirə çəkib eylədi Məcnun məni zülfün,
Ta bir qədəh aldım məni-divanə, ləbindən.

Qoydu qədəmin eşqə ləbin fikrinə Yusif,
Düşdü, neləsin, çahi-zənəxdanə ləbindən.





Çəməndə naləni öyrəndi mürğani-çəmən məndən.
Qəmalud olmağı kəsb etdi bərgi-yasəmən məndən.

Zibəski eylədim hicründə nalə, ey kəmanəbru,
Sərasər təngə gəldi hər nə var əhli-vətən məndən.

Qəmi-hicrinlə var, ey laləruyim, dağ sinəmdə,
Gərək təlim ala adabi-eşqi kuhkən məndən.

Gəl, ey hicranı könlüm xanəsin viran edən dilbər,
Şikayət etməyək hərgiz nə mən səndən, nə sən məndən.

Cəfa səndən, əziyyət səndən, afati-bəla səndən,
Vəfa məndən, məhəbbət məndən, izhari-həzən məndən.

Dəxi bəsdir, bu qədri eyləmə ahü fəğan, ey dil,
Məbadə, incisin ol Yusifi-şirinsüxən məndən.





Gedəndə hər zaman, ey büti-namehriban, gözdən,
Gözüm mərdümləri dəryanı xun eylər rəvan gözdən.

Gözümdən qanlı yaş seylab edib, qəddim kaman oldu,
O gündən kim, məni saldın, ey əbrukəman, gözdən.

Dönüb bir kəc nigahın abidi-şəhri-şikar eylər,
İmam olsa, aman verməz, aman ol cansitan gözdən.

Xətü xalın görən göz mərdümü xunab edər cari,
Bu vazeh bir məsəldir kim, tutar insanı qan gözdən.

Səni bir an görüb, sonra düçari-dərdi-hicr oldum,
Mələk cinsin görən tək tez olur, derlər, nihan, gözdən.

Bu zülfü xalü xəttü hüsni-surət kim, sənin vardır,
Görən Məcnun olur, qan-yaş tökər pirü cavan gözdən.

Məkan tutmuş gözüm mərdümlərində sur tək əksi,
Verirdim yer sənə, olsaydı yaxşı bir məkan gözdən.

Həyatı Yusifin nahəq sənə vabəstədir, ey gül.
Səni, ey mahru hifz eyləsin Rəbbim yaman gözdən.



Razı oldun ki, könül hicrilə bərbad olsun,
Oldu, bundan sora ey məh, ürəyin şad olsun.

Yetməmiş vəslinə saldın məni hicr atəşinə,
Yaxşı yıxdın evimi, get, evin abad olsun.

Bu qədər dərdü qəmü firqətə, ey şirinləb,
Bisütun tab gətirməz, o ki Fərhad olsun.

Mən hara, hicr hara, naləvü fəryad hara,
Görüm, ey çərx, işin naləvü fəryad olsun.

Mən də verdim dilə peyğam ki dönsün qanə,
Ərisin ta hünəri-eşqdə ustad olsun.

İndidən eyləsin adət özünə bari-qəmi,
Ta fərağunda sitəm çəkməyə mötad olsun,

Etmə nahəq yerə sən ahü fəğan, ey Yusif,
Müşkül işdir ki, fəğandan sənə bir zad olsun.





Hər ol aşiq ki, nuş etmiş cahanda eşq camından,
Gərək bilmərrə əl çəksin cahanın nəngü namından.

Məhəbbət camının məsti olunca huşyar olmaz,
Qutarmaz daneyi-xalın əsiri, zülf damından.

Məramı hər dil əhlinin bir mahparə dilbərdir,
Gərək kim, sərbəsər keçsin cahanda öz məramından.

Pərişan zülfə talibsən əgər, cəmiyyət axtarma,
Sevən bir möhtərəm yarı, keçər öz ehtiramından.

Dikib göz, öylə sərməstəm, rüxü zülfünə ol mahın
Ki, agah olmaram hərgiz sipehrin sübhü şamından.

Məgər mərhəm qəbul etsin dili-sədparə, mümkündür?
Təbibim, daxi sən əl çək, bu zəxmin iltiyamından.

Əgər, ey talibi-izzət, Züleyxayi-məhəbbətsən,
İçib bir cami-ruhani, eşit Yusif kəlamından.

Cəfa çək, dərdü qəm çəkmə, həmiyyət eylə, rüsva ol,
Salamat olginən xəlqin riyapərvər salamından.



Əzbəs ki, əşki-çeşmimi etdim rəvanə mən,
Kuyi-nigarımı elədim rudxanə mən.

Əşki-dü çeşmü rədi-qəmü bərqi-ah ilə,
Ruyi-zəmini döndərərəm asimanə mən.

Oldum həmişə dərdü qəmi-hicrə mübtəla,
Ey kaş, gəlməyəydim əzəldən cahanə mən.

Girəm ki, əşki-çeşmimə qıldım nihan əlac,
Bəs neyləyim bu naləvü ahü fəğanə mən?.

Əlbəttə, tənələr oxu şayəstədir mənə,
Dil vermişəm o guşeyi-əbrukamanə mən.

Taci-Kəyani eyləmərəm, Yusif, arizu,
Qoysam əgər ki, başımı ol asitanə mən.





Verdim könül bir ahunigah yarə tazədən.
Oldum əsir o gözləri xummarə, tazədən.

Əbruyi-yarə bənd idi biçarə dil, vəli,
Düşdü kəməndi-türreyi-tərrarə tazədən.

Ey şanə, zülfi-yardə bənd olma, rəhm qıl,
Zinhar, eyləmə günümü qarə, tazədən.

Hər gündə gün gəlir, görə bilməz camalını,
Çün sübh oldu, düşər yenə kuhsarə, tazədən.

Gizlətdiyiçün arizi zülf içrə hər sabah,
Xurşid özün vurur dərü divarə, tazədən.

Fəsli-bahar gəldi, fəğan etmə, əndəlib,
Vəcd ilə gəldi gül yenə gülzarə, tazədən.

Güllər açıldı rəşki-behişt oldu gülsitan,
Düşdü çəməndə bülbül işi xarə, tazədən.

Ol Yusifin camalını vəsf eylədin, könül,
Amadə ol, çəkilməyə bazarə, tazədən.



Bəid olmazmı can pərvası canan istəyənlərdən,
Qəbul eylərmi canan xidməti can istəyənlərdən.

Vətən taliblərin kilki-maarif yazsa qabildir,
Cahan mülkündə məxluqu pərişan istəyənlərdən.

Vətən sən istəyirsən, özgələr də istəyir, amma
Becüzv üdvan nə hasildir bu ünvan istəyənlərdən?

Vətəndən ötrü öz həmcinsini pamal edərsənmi?
Zəhi həsrət bu novi əqlü ürfan istəyənlərdən.

Bu dünya bir vətəndir, onda sakinlər onun əhli,
Məbadə, olma bu dünyada rəhcan istəyənlərdən.

Nə gəbrü nə müsəlman, nə yəhudi, çox təəccübdür,
Bu kinü bu ədavət, dinü iman istəyənlərdən.

Əgər insan isən beynəlbəşərdə ittihad istə,
Məhəbbət gözləmə bir tək müsəlman istəyənlərdən.

Vətən sevmək deyildir, Yusifa, bir fəxr aləmdə,
Odur insan ki, olsun cinsi-insan istəyənlərdən.

Kəlamın eyni-müsdaqi, kəlam ancaq kifayətdir,
Günün var olmağında olma bürhan istəyənlərdən.



Var üzrü çıxsa, çıxmasa xülfi-hicabdən,
Üz döndərərsə şəbpərə gər afitabdən.

Nəqşü nigarü surətü əlfaz olur üzün
Göstərməyincə şahidi-məna niqabdən.

Sinayi-sinədən necə eylər zühur eşq,
Can nuru cilvələnməsə cami-şərabdən.

Möcüz deyilmi ləli-ləbin tərləyən zəman,
Hərgah desəm, çıxarır mehr rüxün atəş-abdən.

Hər sübh gülüstanda edər çün nigar seyr,
Gül qönçəsi odur ki, açılmaz hicabdən.

Çeşmin yatan zamanda yatar fitnələr hamı,
Bidar olur tamam ayılan vəqt xabdən.

Çıxsın məhəbbətin ürəyimdən, məhaldır,
Hər qədr gəlsə tənə oxu şeyxü şabdən.

Könlüm yananda qanla sirişkim axar, nola,
Xunablər axıb tökülür hər kəbabdən.

Şirin olur kəlamı nədəndirsə Yusifin,
Şeiri məgər mürəkkəb olub şəhdi-nabdən?



Dəmadəm eylədik tərif insaf ilə vicdandan,
Vəli insaf nə, vicdan nədir bibəhrələr ondan.

Həmişə bəhslər qıldıq, danışdıq ünsi-ülfətdən,
Belə vəhşilik etdik kim, verilməz fərq heyvandan.

Qənaət eylədik izhari-ismi-elmü ürfanə,
Vəli səd heyf kim, məhrum qaldıq elmü ürfandan.

Mükafat elmdən bixəbər peyvəstə qan tökdük,
Bunu dərk etmədik kim, müxtəlif qanlar çıxar qandan.

Ləkədkubi-qəm olduq, payimali-möhnətü zillət,
Yenə əl çəkmədik lafü kəzabü kizbü böhtandan

Tərəqqivü təali fikrinə ümmid yox əsla,
Həzar əfsus bu süst ünsürü hali-pərişandan.

Keçəl qonşunun zülfünə daim iftiqar etdik,
Mühəqqərkən dedik izzü vəfavü şövkətü şandan.

Gədayi-məhz ikən şahəm deyib fəxr eylərik daim,
Deyilmi eyb şəhlik iddiası şəxsi-üryandan.

Ağız halva deməklən, bu məsəldir, olmayır şirin,
Fəqət insan olurmu söz misali ləfzi-insandan?

Cahan cənnəti-təcri təhtəhülənhar olur, Yusif,
Əgər tarixi-min üç yüz otuz beş çıxsa böhrandan.



Ey pəritələt, bu tələt kim sənin var, kimdə var?
Ey mələksurət, bu surət kim sənin var, kimdə var?

Gülşəni-eşqində əfqan etsə bülbüllər nola,
Ey güli-tər, bu lətafət kim sənin var, kimdə var?

Əyrilərdən xəm qaşı vəslinə oldun dəstrəs,
Ey məhi-no, bu səadət kim sənin var, kimdə var?

Tirü peykansız tökərsən qanım, ey səyyad sən,
Seyd işində bu məharət kim sənin var, kimdə var?

Qəmzələr peykanını məndən diriğ etməz müjən,
Ey kəmanəbru, bu rafət kim sənin var, kimdə var?

Səbr qıldın hər nə kim dəydi bəla peykanları,
Ey könül, bu istiqamət kim sənin var, kimdə var?

Təbi-namövzun ilə şair qoyubsan adını,
Yusifa, gör bu fərasət kim sənin var, kimdə var?





Ey gül, səri-zülfündə hər dil ki, məkan eylər,
Bülbül kimi həm varə fəryadü fəğan eylər.

Hər aşiqi-bidil kim, sən tək ola məşuqu,
Ancaq o bilir hicrin könlüm necə qan eylər.

Hicran ələmin sanma bir mətləbi-asandır,
Yüz fəsli-bahar olsa, bir gündə xəzan eylər.

Sirri-dəhənin sirrin dünyada bilən yoxdur,
Sözdür hərə qəlbində bir növi güman eylər.

Mən duzəxiyəm guya cənnətdən olum xaric,
Zahid mənə kuyində təklifi-cinan eylər.

Heç özgə əvalimdə seyr eyləmə, ey naseh,
Bir ayrı gülüstanda könlüm təyəran eylər.

Nəfs əhlini eşq əhli, zinhar, qiyas etmə,
Bir ruhi-mücəssəmdir, o sərfeyi-can eylər.

Müşküldü bu aləmdə seyr eyləyə hər aşiq,
Çün sərfi-müsibətdir təklifi-kəran eylər.

Zövq əhli bilir eşqin payani-təmənnasın,
Pərvanəyə fikrin ver, gör bir nə fəğan eylər.

Eşq aləmi vaqedə bir aləmi-digərdir,
Düşsən biləcəksən ki, Yusif nə bəyan eylər.



Xəyal eylər könül, dərdin desin dildarə, müşküldür.
Xəyal asandır, amma zahir etmək yarə, müşküldür.

Vüsali-yar üçün hicran günü pərvaz edər könlüm,
Bahar əyyamı bülbül gəlməsin gülzarə, müşküldür.

Təbiba, çəkmə zəhmət, eyləmə nahəq yerə guşiş
Ki, dərdi-eşqdir, bu dərdə olsun çarə, müşküldür.

Cəfasız, cövrsüz eşqü məhəbbət payidar olmaz,
Bəlavü hicrsiz etmək təməə didarə, müşküldür.

Yetişməz yarına hicr atəşində yanmayan aşiq,
Özün, eşq olmasa, pərvanə vursun narə, müşküldür.

Ləbin ləlin görüb, ey laləru, əfqanə gəldim mən,
Görəndə qönçə bülbül gəlməsin göftarə, müşküldür.

Züleyxa eşqinin rəcvani var, əlbəttə, cazibdir,
Məhəbbət Yusifi çəkdirməsin bazarə, müşküldür.





Səhabdır, sənəma, kim camali-afdədir,
Və ya ki türrə o mehr mülki mütafdədir.

Həlaldır o və ya kim, pərənd qatildir
Ki, hacib olmağına aləm ixtilafdədir.

Əgər həlaldır, hərgiz, həlal qan tökməz,
Məgər ki, sariyi-Mərrixdir, qılafdədir?

Olur ki, qibleyi-üşşaq taqi-əbrudur,
Bu səcdəgahdə üz döndərən xilafdədir.

Müqabil olsa hamı Kəbeyi-murada yetər,
Bu qiblədən məgər onlar ki, inhirafdədir.

Götür niqabını üzdən neçün ki, şəhr əhli
Deyər ki, mehri-dirəxşan da inkisafdədir.

Cahanı eylədi rövşən ziyayi-danişü elm,
Hənuz zahidi-bizövq etikafdədir.

Təvəqqüf eyləyə bilməz zəif olan rubəh,
Gözündə şiri-jəyan mörüzi-müsafdədir.

Xəfayə çək özünü, get, dayanma, ey xəffaş,
Saqın ki, pərtövi-xurşid inkişafdədir.

Əbəs yerə təyəran etmə, itməsin gəncin,
Kəmali-çərxin əsası kuhi-Qafdədir.

Məhəbbət ilə könüllərdə var münasibəti,
O rabitə ki, bu gün tari-teleqrafdədir.

Vəfavü mehrü məhəbbətdir ümdeyi-məqsud,
Bu gün bu Kəbəyə külli-cahan təvafdədir.

Məhəbbət olmasa, eşq olmasa, cahan olmaz,
Bu mətləbə ürəfa küllən etirafdədir.

Qalırdı çahi-Ədəmdə müdam, Yusif, şeir,
Əgər biləydi ki, miqdarı bir kəlafdədir.





Göyərmiş qəbrim üstündə demə kim, gül giyahımdır.
Təcəssüm eyləmiş bu surət ilə dudi-ahımdır.

Xətü xalü rüxü zülfi-siyahındır xəyalımda,
Şəbi-tarın ruzi-rövşən işrə mehrü mahımdır.

Qul olmaq asitanında qübari-rəhgüzar olmaq,
Mənim fəxri-mübahatım, məqamü izzü cahımdır.

Gədayi-kuyinəm, sən şahi-iqlimi-məlahətsən,
Həmişə səcdəgahi-asitanın qibləgahımdır.

Sənə aşiqliyim məşhuri-aləmdir, deyil pünhan,
Dəmadəm seyli-əşkü şöleyi-ahım güvahımdır.

Qəmi-eşqində daim rəhsiparəm, yoxdur aramım,
Nə şeyxin pəndi, nə xəlqin cəfası səddi-rahımdır.

Fərağında nə zəhmət, nə məşəqqatə düçar olsam,
Mənə müşkül deyil, zövqi-vüsalın dadxahımdır.

Nə şeyx almaz səlahım, nə xəlayiq etina etməz,
Sənə, ey məhliqa, aşiqliyim ancaq günahımdır.

Külahım guşəsin zövqüm ucaldar ərşi-əlayə,
Əgər zikr eyləsən: Yusif mənim əbdi-siyahımdır.



Ruhun qidası söhbəti-əhli-kəmaldür.
Canan pəyamı aşiqə eyni-vüsaldür.

Aqildən eşq umma, inanma ki, bir yerə
Eşq ilə əql cəm ola, əmri-məhaldür.

Bir yerdə eşq xeymə qurar, əql mat olur,
Əqlin lisani eşq hüzurunda laldür.

Hər təlxkamı aləm ara şadkam edən
Bir dilbəri-şəkkərləbü şirinməqaldür.

Canandan özgə hər nə xəyal etsən, ey fəqir,
Zənnü gümanü surətü nəşqü misaldür.

Hər bütpərəst üçün büt isə laməhalə var,
Sən sacid olduğun hamı vəhmi-xəyaldür.

Meyxanədə mey olmasa, olmaz bu nəşələr,
Hər bir əlif o qaməti-dildarə daldür.

Səccadədən götür üzünü, yarə qıl nəzər,
Fitva verəndə piri-muğan, mey həlaldür.

Eşq əhlinin məqamını dərk eyləməz fəhm,
Əql əhlinə məqami-məhəbbət məlaldür.

Məcnun üçün kəmali-sədarətdə əsl söz
"Leyli" sözüdür, yerdə qalan qeylü qaldür.

Zahid sözünə bavər edib baxma Yusifə,
Kafər də olsa Yusif əgər, əhli-haldür.



Dana nəyi bilsə, ona danadı deyərlər.
Ya hər şeyi bilsə, ona danadı deyərlər.

İsmi-ələfi, ya sələfi bilsə biri ya,
Təmi-meyi bilsə, ona danadı deyərlər.

Ya tarzən olduqda və ya nəğmədə mahir,
Çalsa, nəyi bilsə, ona danadı deyərlər.

Bir kəs əlifi anlasa, dana olur adı,
Ya kim beyi bilsə, ona danadı deyərlər.

Bilmək ki, onun adı ərəbcə deyilib elm,
Bir şəxs "e"yi bilsə, ona danadı deyərlər.

Çuban sürünü sürməyə səhradə ələfçün,
Bir "hey-hey"i bilsə, ona danadı deyərlər.

Gül əkməyi, gil çəkməyi, yaniki danışmaq
Peydərpeyi bilsə, ona danadı deyərlər.

Ya Yusif əgər qafiyəpərdazlığında
Hər nükteyi bilsə, ona danadı deyərlər.

Bilmək ki, bilə camevü həmdü hədü məqbul,
Aya nəyi bilsə, ona danadı deyərlər.

Bu bilməyi ta mən deməsəm, bilməyəcəksən,
Bir nöqteyi bilsə, ona danadı deyərlər.



Dedim: - Ey qönçələb, qəlbin pərişan eyləyən kimdir?
Dedi: - Hicrimdə hər şəb ahü əfğan eyləyən kimdir?

Salan kimdir məni dərdü bəlayə eyləyib rüsva,
Müşəxxəsdir bu kim eşqimdə tüğyan eyləyən kimdir?

Dedim: - Hicri-ləbinlə, ey sənəm, qan eylədin könlüm,
Dedi: - Vazehdi bu, inkari-iman eyləyən kimdir.

Ləbi-yar istəyən, əlbəttə, qan olsun gərək könlü,
Əziyyət çəkməmiş sevdayi-canan eyləyən kimdir?

Sənün könlün qəmi-hicr ilə mən qan eylədim girəm,
Mənim, ey bivəfa, bəs könlümü qan eyləyən kimdir?

Dedim: - Ey mahru, aşiq məgər məşuqə cövr eylər?
Dedi: - bəs Yusifi pabəndi-zindan eyləyən kimdir?

Edən kimdir Züleyxa tək cahanda isməti zail,
Cırıb pirahənin, məşuqə böhtan eyləyən kimdir?

Təğazayi-məhəbbət dərdü rəncü qüssəvü qəmdir,
Məhəbbət müşkül işdir, ani asan eyləyən kimdir?

Dedim: - Bəs atəşi-hicranə axır kim əlac eylər?
Dedi: - Gör nari-Nəmrudi gülüstan eyləyən kimdir.

Təmənnayi-dili-Mahmudu bir quldan qiyas eylər,
Baxıb gör padişahı bəndəfərman eyləyən kimdir?

Dedim: - Bəs Yusifi-biçarəyəm, əfv eylə təqsirim,
Dedi: - Get, get, sən ilə eşq mizan eyləyən kimdir?



Ərəq ilə güli-rüxsarın ola nəm, xoşdur.
Qona başında əgər laləyə şəbnəm, xoşdur.

Tiri-müjgan ilə çeşm iksi də qatildi mənə,
Xəmi-əbrular əgər düşsə müqəddəm, xoşdur.

Buyi-zülfün mənə xoşdur güli-rüxsarında,
O da xoşdur mənə, həm ayinə bahəm xoşdur.

Sən rizasan əgər olsun mənə aləm düşmən,
Nə sözüm var mənim, bəs mənə aləm xoşdur.

Qəm əgər yar qəmidir, əcayib aləmdir qəm,
Nə gərəkdir dəxi üşşaqə fərəh, qəm xoşdur.

O məhin zəxmi-xədənginə əlac etmə, təbib.
Qoymasan gər o vuran yarəyə mərhəm, xoşdur.

İstəyir yar əgər ahi-dəmadəm çəkəsən,
Çəkmə qəm aşiq üçün, ahi-dəmadəm xoşdur.

Eşq sevdası bu aləmdə əcəb sevdadır,
Nə olur cənnət üçün qəm, nə cəhənnəm xoşdur.

Xubü bəd, hüzn, fərəh, şadiyü qəm, matəmü eyş,
Yusifa, aşiqə hər aləmü adəm xoşdur.`

Eşq dəryası üçün qətrəyə hacət yoxdur,
Nuh tufanı üçün gəştiyi-əzəm xoşdur.



Könül quşu ki, onun qəm yuvasının biridir,
Yuvadan ayrılamaz aşinasının biridir.

Fərəh tərəf təyəran eyləməz ki, qəm həm onun
Fəzayi-aləmi-behcətfəzasının biridir.

Diyari-eşqdə Məcnunu sevmişəm, nə üçün?
Mənim kimi o də qəm mübtəlasının biridir.

O sərvü laləüzarın çəməndə sərvi-səhi,
Dirəxti-bisəmərü xudnümasının biridir.

Cahanda çoxdur onun aşiqi vəli, Xurşid
Onun bir aşiqi-bidəstü pasının biridir.

Fəqihi-mədrəsədən sorma rəmzi-eşqi ki, o
Xərabənin çürümüş buriyasının biridir.

Xuda səfinəsinin sakinindən ol, ey dil
Ki, Nuhi-naci naxudasının biridir.

Əba-qəba demə zahid işində mahirdir,
Onın hər ikisi təqva əbasının biridir.

Şəbi-fəraqdə çək ah dəmbədəm, Yusif
Ki, eşq aləminin iqtizasının biridir.



Ətrafın almış ol sənəmin mahparələr,
Ay dövrəsində sanki düzülmüş sitarələr.

Zülfündə min könül quşunun aşiyanı var,
Bir şaxi-güldə məskən edib min həzarələr.

Əl dəymə yar zülfünə rəhm eylə, ey səba,
Çün bəstədir ona neçə min bəxtiqarələr.

Ey didə, tökmə yaş ki, görmək zamanıdır,
Qıl bir o gül camala doyunca nəzarələr.

Əşk ilə dərdə olmayacaq çarə, ey könül,
Bir bəhrə düşmüsən ki, görünməz kənarələr.

Bir zərrə könlü gəlmədi insafə ol məhin,
Mum oldu bu məhəbbət ilə səngxarələr.

Ahın şərarəsi yetişib çərxə, Yusifa,
Vəhm et, tökülsə yer üzünə bu şərarələr.





Hər kimdə kamal olmasa ürfanlığa dair,
Göftarı olur bisərü samanlığa dair.

Bidanişü ürfan necə hikmətdən urar dəm,
Ta olmasa xasiyyəti loğmanlığa dair.

Gər xatəmi bir əhrimən eylərsə də sərqət,
Ondan tapılır can Süleymanlığa dair.

Öz-özünə bir şəxs müsəlmandısa, olmaz
Gər olmasa ətvarı müsəlmanlığa dair.

Tac ilə deyil səltənətü təxt ilə dövlət,
Sultanda gərək baş ola sultanlığa dair.

Hər surəti insan olan olmaz özü insan,
İnsanda gərək fəhm ola insanlığa dair.

Sözdən bilinir gövhəri-əsliyyeyi-insan,
Dana danışırmı sözü nadanlığa dair?

Bəs fərq nədir adəmü heyvan arasında?
Hərgah danışsın sözü heyvanlığa dair.

Bu əsrdə gəl sən də pərişan sölə, Yusif,
Əsbabi-fərahimdi pərişanlığa dair.



Can arizuyi-xəncəri-müjgani-yar edər.
Dil qəsdi-tiri-qəmzeyi-çeşmi-xumar edər.

Mən onlara dedim ki, bir az eyləyin sükut,
Canan görək ki, hansı birin ixtiyar edər.

Cəngü cədəldədir bu iki canü dil hənuz,
Ta olmasın xəyalı nə yerdə qərar edər.

Can bir fəqir candı ki, cəllada tuş olur,
Dil bir yetim quşdu ki, şahin şikar edər.

Əşkim bu yandan eyləyib ahəstə meyli-seyl,
Guya o da nəm olduğunu aşikar edər.

Hər aşiq öz həbibinə sərgərmdir vəli,
Yusif aradə boş yerə fəryadü zar edər.





Təriqi-eşq ilə hər kim gedər, hidayət olur,
Əgər yetişməsə məşuqdən inayət olur.

Məhəbbət əhlinə rəhbərdir şiveyi-məhbub,
Yorulsa rahdə ondan ona himayət olur.

Mühibbi-sadiq olan dərdü qəmdən incinməz,
Nə hübbi-qeyr olur onda, nə bir şikayət olur.

Fəğanü nalə təğazayi-hicrdir, amma
Vüsal ümmüdü ona hər zaman kifayət olur.

Bu yolda əql kifayət verən deyil, cana,
Təəqqül eyləmə gəl eşqdən hekayət olur.

Bir aşiqin nə vilayətdə olsa məşuqu,
Həmişə fikr ilə zikri həmin vilayət olur.

Bahar ümmüdünə əfğanlar eylə, ey bülbül
Ki, qış zamanına, əlbəttə, bir nəhayət olur.

Məbadə sən  özünü, Yusif, aşiq etmə hesab
Ki, eşq cəzbələrində bir özgə ayət olur.



Əlaci-dərdi-dil, saqi, şərabi-sağərü bütdür,
Büsati-eyş cəngü dəfü sürudi-nai-bərbütdür.

Axar gözdən sirişki-tər peyapey xəddü rüxsarə,
Deyərsən Dəcleyi-Bağdaddür, ya Ceyhun, ya Şəddür.

Büta, səd afərin ol zülfi rüxsarü xətü xalə,
Əcəb zülfü əcəb rüxsar, əcəb xalü əcəb xətdür.

Dəmadəm didəvü dildən tökər qan noki-müjganın,
Rəiyyətdir, bəli, sultan ona daim müsəllətdür.

Kəmalat əhli zahiddən kəmalat istəməz hərgiz,
Kəmalatı onun küllən gümanü zənnü əhvətdür.

Həqiqət rahinin salikləri zənnü güman etməz
Ki, innə zənnə layəğni minəllahi-mürəbbətdür.

Qədəm çəkməzdi Yusif kim, dəri-meyxanədən, dün gün
Eşitdim tərki-cami-mey qılıb miskin, müxəbbətdür.





Oldu bahar, gəldi çəmənzarə lalələr,
Hər lalə tutdu bəzmi-çəməndə piyalələr.

Rüxsari-yarə qondu ərəq zövqi-badədən,
Gül bərginə qonan kimi gülşəndə jalələr.

Tutduqca bəzmi-eyşdə cam, oldular cavan,
Pirani-paki-tinətü həftadsalələr.

Gəldi xurama naz ilə gülzari-eşqdə
Xubani-sərvqaməti-mişkingülalələr.

Sübhi-vüsal açıldı, yetişdi zəmani-eyş,
Tərk oldu asimanə çıxan ahü nalələr.

Səd şükr kim dəyişdi cahan, indi yazılır
Hər gün risalələr əvəzində məqalələr.

Şayəd ki, dustlər  oxuyanda kəlamını,
Bəzmi-çəməndə Yusifi də yadə salələr.





Dəyəndə zülfi-ənbərbari-yarə şanələr bir-bir,
Cinun zəncirinə bənd oldular divanələr bir-bir.

Açıb ruxsarını saldı cahana hüsnü bir atəş,
Vurarlar özlərin bu atəşə pərvanələr bir-bir.

O zülfi-mişkbarə dinü dil verməк xəyalilə
Cinun rəxtin geyindi aqilü fərzanələr bir-bir.

Məhəbbət kəlməsi ləli-ləbindən aşikar olcaq,
Sərasər aşina rəsmin tutar biganələr bir-bir.

Yetişdi sağərin əyyami, fəsli-nobahar oldu,
Nə xoş gündür açıldı tazədən meyxanələr bir-bir.

Quruldu məclisi-işrət, fərəhnak oldu bəzm əhli,
Peyapey dövrə gəldi bəzmdə peymanələr bir-bir.

Qədəhnuş oldu zövqi-eşqdən hər arifi-ali,
Şərabi-nabdən məst oldular məstanələr bir-bir.

Meyü meyxanələr müştaqıdır hər abidü zahid,
Əcəb mətruk olundu səbheyi-səddanələr bir-bir.

Açıldı sirri-yöhyil-ərz, bəd mötiha, Yusif,
Ülüvv eylər, olur hali əkilmiş danələr bir-bir.



Ləlin xəyalı ilə könül meyli-cam edər,
Əşkim qatar su badəyə hər gün haram edər.

Cismin görüb, vüsalına müştaq olur könül,
Müflis görəndə sim, xəyalati-xam edər.

Hüsnün xəyalı çöhreyi-xurşidi qıldı zərd,
Qaşın xəmi hilalı bir ayda tamam edər.

Rüxsarını görübdü o gündən ki, afitab
Torpağa hər sabah düşüb ehtiram edər.

İllərdir arizuyi-rüxü zülfün ilə çərx
Peyvəstə şamı sübh eləyib, sübhü şam edər.

Yusif gəlir tərənnünə ləlin həvasına,
Sevdayi-qönçə bülbülü şirinkəlam edər.





Bu gün, ey əhli-aləm, küllən olmaq aşina xoşdur.
Məhəbbət yaxşı şeydir, rifətü sidqü səfa xoşdur.

Hamı bəhri-şaxəvü bərg, səmərlər bir şəcərdəndir,
Əgər bir gülsitanda eyləsən nəşvü nüma xoşdur.

Ədavət zümreyi-insan üçün layiq deyil hərgiz,
Məhəbbət xoşdu, ülfət xoşdu, mehr ilə vəfa xoşdur.

Cahanda dərdi-bidərmandır bu etinasızlıq,
Əgər bu kəlməyə filcümlə olsa etina, xoşdur.

Qiyam etmək gərək ta söz yetişsin qüvvədən felə,
Keçən keçdi, əgər bu gündən olsa ibtida, xoşdur.

Cəmiən bu sənaye, bu hünərlər feyzi insandır,
Vəli, insan özü qəflətdədir, bu macəra xoşdur?

Ayılmaq xabi-qəflətdən bu gün lazım gör, amma
Bu şərtilə daneş olsun müqtəda xoşdur.

Vücudi-əhli-daneş vaqeən iksiri-əzəmdir,
Əgər bu nüktə, fikr eylin biintiha, xoşdur.

Kəmalü mərifəti-ərbabi-daneş yetər, Yusif,
Bu məzmunə əgər bir qeyri çür etsən əda, xoşdur.



Müjgan oxun atanda ol mahparə bir-bir,
Canlar nisar olurlar müjgani-yarə bir-bir.

Ərzi-üzar o dilbər etdikdə xəlqi yeksər,
Müştaq olub gedirlər kuyi-nigarə bir-bir.

Tutdu o mahparə üz xəlqi-ruzigarə,
Hər gün bu şaxsarə qondu həzarə bir-bir.

Ağladı kim ki gəldi, didəm yaşı deyildi,
Guya yerə töküldü göydən sitarə bir-bir.

Lütfü onun deyil kəm, ol mahi-mehr tövəm,
Aşiqlərinə hər dəm eylər nəzarə bir-bir.

Eylər o bavəfanın lütfü o məhliqanın
Hər dərmənd olanın dərdinə çarə bir-bir.

Canan səfa gətirdi, aşiq sözün bitirdi,
Güllər özün yetirdi fəsli-baharə bir-bir.

Səbz oldu çün gülüstan, güllər açıldı hər yan
Qondu həzar dəstan yüz şaxsarə bir-bir.

Yusif birinci bəndəədd oldu bu çəməndə,
Aşiqlərin edəndə ol məh şümarə bir-bir.



Gülşəndə nələr var ki, rüxi-yardə yoxdur,
Meydə nə əsər kim, ləbi-dildardə yoxdur.

Şəkkər dəhənin söylədilər, səhvdi, söz yox,
Şəkkər sözü bu nitqi-şəkərbardə yoxdur.

Rəftardə bir gün dedilər kəbki-diriğdir,
Səhv eylədilər, kəbk bu rəftardə yoxdur.

Hər kim desə mişkin o səri-zülfə, xətadır,
Bu mişki-xətin tibleyi-əttardə yoxdur.

Bilməzlə ki, gül xardən olmuş niyə mümtaz,
Fərqi budu: güldə nə ki var, xardə yoxdur.

Fikr eyləmə, ey dust ki, hər neydə nəva var,
Fərz eyləmə, bu zümzümə hər tərdə yoxdur.

Əhbab deyər, gülşənə gəl, seyr elə, Yusif,
Mən istədiyim gül ki, o gülzardə yoxdur!





Zülfi-mişkindir ki, çin-çin arizi-dilbərdədir,
Ya sipahi-Əbrəədir, Xosrovi-Xavərdədir.

O müsəlsəl zülfdəndir türreyi-şəbrəngdən,
Hər nə kim ətri-gülabü müşk ilə ənbərdədir.

Uddur məcmərdə, ya kim, buyi-zülfi-yardır,
Nöqheyi-badi-səba bu buyi-canpərvərdədir.

Mehrpərvərdir o zülfi-müşküfami-pürgireh,
Ondan ötrü daima ol arizi-ənvərdədir.

Fitrətü xasiyyəti məstur ikən çox pəst imiş,
Vaizin vəzi əgərçi ərşeyi-mənbərdədir.

Ruyi-gülrəngində zülfi, zülfi-şəbrəngində ru,
"Vəzzüha vəlleyli yəfşi" ayəsi müzmərdədir.

Yusifa, tarixi-min üç yüz otuz üç pərdəsi
Altı səhnindən cahanın axırıncı pərdədir.





Nigarım arizin ta əbri-zülfündən əyan eylər,
Fələk öz mahını xiclət çəkib gözdən nihan eylər.

Xəyal etmə qiyas eylər fələk bir mahi-no zahir,
Görüm əbrusuna təşbih olurmu? İmtahan eylər.

Görüb ruxsarını zülf içrə könlüm payibənd oldu,
Bəli, bülbül gəzər, gül şaxəsində aşiyan eylər.

Dedim: - Kimdir məni məqtuli-tiri-eşq edən, ey dil?
Dedi: - Ey aşiqi-biçarə, ol əbrukaman eylər.

Büta, sərva, nigara, məhvəşa, xurşidruxsara,
Camalın arizusun xəstə könlüm hər zaman eylər.

Sən ol yari-Məsihaxislətü xurşidi-tələtsən
Ki, ecazi-ləbin hər gündə min ehyayi-can eylər.

Ləbi şəkkərfəşanın şurudur, ey xosrovi-xuban
Ki, əhli-aləm içrə Yusifi şirinzəban eylər.





Kəmali-eşq zövqündən füzun dərdü məlalım var,
Bihəmdillah ki, məcnuni-rəhi-eşqəm, kəmalım var.

Nə mülkü malə bəndəm, nə sərü samanə xorsəndəm,
Neçün ki, dəhrdə bir dilbəri-xoşxəttü xalım var.

Əgərçi firqət əyyamındayam, amma qəmim yoxdur,
Məhəbbətdən o heysiyyətlə kim zövqi-vüsalım var.

Dalımca daş atan, hər gün düşər, ətfal minlərcə,
Cünun mülkündə sultanam, sipahım var, cəlalım var.

Qəmi-dünyanı qoy çəksin olan kim, etibar istər,
Mənim yox hörmətim, bir dilbəri-şirinməqalım var.

Ləbi-dildardən sordum keçən gün axırın eşqin,
Dedi: - Səbr eylə, Yusif, səndən ötrü bir xəyalım var.





Əgərçi cami-məhəbbət şərab ilən doludur,
Vəli, bir atəşə bənzər ki, abilən doludur.

Vücuda mənfəəti olmasa, nə faidəsi,
Kəbabxanə əgərçi kəbab ilən doludur.

Qulaq tut demə söz vaizin nəsihətinə,
Nəzarə məscidə qıl, şeyxü şəbab ilən doludur.

Su içmək olsa əgər məqsədin bu mərhələdən,
Keç ey susuz, bu biyaban sərab ilən doludur.

Çiraq o vəqtdə lazım gəlir ki, zülmət ola,
Cahan ki, şəşəeyi-afitab ilən doludur.

Tamam xabdədir, yoxdu bir nəfər bidar,
Məgər o nərgisi-fəttan ki, xab ilən doludur?

Xuramə gəldi o qamət, qiyamət oldu əyan,
Odur ki, qəlbi-cahan iztirab ilən doludur.

Nişat vəqti yetişdi, ayıl bir, ey qafil,
Bu bəzm naleyi-cəngü rübab ilən doludur.

Kəlamı Yusifin, əzbəski, şuxü şirindir,
Yazanda xaməvü dəftər zibab ilən doludur.



Meyü zövqü zərafət zümreyi-ürfanə layiqdir.
Kəmalü mərifət, əlbəttə ki, insanə layiqdir.

Ləbi-dildardən abi-həyat istər dili-aşiq,
Məhəbbət əhlinə həm badə, həm peymanə layiqdir.

Bu vazehdir ki, canü tən sevənlər vəslə yetməzlər,
Məhəbbət atəşində yanmağa pərvanə layiqdir.

Kəmal ilə bu meydanə qədəm qoymazlar aqillər,
Buna məcnun gərək, seyr etməyə divanə layiqdir.

Şəkər şirindir, amma naxoşun haliyçün, ey Məcnun,
Dəvayi-təlxi-bitəmi-təbabətxanə layiqdir.

Bunu dərk eyləməz əql əhlinin əqli, bu meydanə
Cinun sərdəftəri bir Qeys tək fərzanə layiqdir.

Ədavət eyləyənlərədd olur əmvat hökmündə,
Məhəbbət olmayan bir zat qəbristanə layiqdir.

Məhəbbət əhlinin payinə payəndaz ol, ey Yusif
Ki əhli-mərifətdir xidmət əhli, canə layiqdir.



Ey gülüstani-vəfa içrə güli-tər Azər,
Asimani-hünərə mehri-münəvvər Azər.

Getdi zülmati-şəbi-tirə, çıxıb mehri-münir,
Nurə qərq eylədi afaqi sərasər, Azər.

Aləmi şəmsi-həqiqət eyləyibdir rövşən,
Qalmamış məniyi-gün xəlqə müsəttər, Azər.

Olsa gər dideyi-həqbinü yəqin aləmdə,
Surəti-həqqi görər zahirü əzhər, Azər.

Keçdi sərmayi-zimistan, yetişib fəsli-bahar,
Ətri-gül eylədi dünyanı müəttər, Azər.

Elədi şahidi-məqsudi-cahan ərzi-camal,
Etdi dünyanı camalilə münəvvər, Azər.

Oldu aləm meyi-minayi-məhəbbətdən məst,
Sən də nuş eylə bu meydən neçə sağər, Azər.

Sən də çək başına Yusif kimi bir sağəri-eşq,
Qoy desinlər sənə də dəhrdə kafər, Azər.



O zülfi-ənbərə hər dəm ki, yar şanə çəkər,
Başımdan ahım odu şəm tək zəbanə çəkər.

Görüb camalını aşiq məhaldır edə səbr,
Məhəbbət əhlini gül zövqü gülüstanə çəkər.

Könüldə razi-niyaz eyləyir nigarı ilə,
Odur ki, aşiq özün guşeyi-nihanə çəkər.

Könül nə səmtə dolansa xəyali zülfdədir,
Məkan məhəbbəti hər mürğü aşiyanə çəkər.

Müğənni olmasa məftun çeşmü əbrudan,
Kamançaya bu qədər məst taziyanə çəkər?

Çəkəndə surəti-zibasını müsəvviri-dəhr,
Qaşın hilal, gözün fitneyi-zəmanə çəkər.

Məgər o zülfi-siyahın əsiridir Yusif
Ki, hər nəfəsdə o bir ah, aşiqanə çəkər.





Bu hərflər o əlif qamətin ”bey”indəndir.
Bu məstliklər o meyxanənin meyindəndir.

Bu nəhrlər ki, olur bəhri-eşqdən cari,
O dilrübanın iki çeşməli “hey”indəndir.

Bu nəşələr o şərabən-təhur nəşəsidir,
Bu badələr o ləbi-Kövsərin “sey”indəndir.

Əbəs deyil ki, gəlir əhli-eşqdən bu nəva,
Bu nalələr hamı ol “nun”un neyindəndir.

Əgərçi “rey” səbəbi-ahi-əhli-eşq idi, leyk
Bu nəşə də kim, o büti-növrəsin “rey”indəndir.

Bu badələr, bu fərəhlər, bu eşqü cazibələr
O hüsn sahibinin bilmirəm nəyindəndir.

Diriltdi aləmi eşqin nidasi, ey Yusif,
Bu zindəlik də oların zikr, ya heyindəndir.





Bu nov ilə ki, rəftarə gəlir bu sərvqamətlər,
Yaxındır əhli-eşqin başına qopsun qiyamətlər.

Demə, ey müddəi kim, aşiqəm ol mahruxsarə,
Söz ilə mümkün olmaz, eşq üçün vardır əlamətlər.

Qabaqca eşq asan görsənir, amma olar vazeh
O gün ki, xəlqdən tüğyan edər səngi-məlamətlər.

Xəbər tutmaz gözüm yaşından onlar kim, deyil aşiq,
Xətərnak olduğun dəryaların bilməz səlamətlər.

Bəlalar kəlmeyi-eşqin həvalisində sayirdir,
Bu yolda istiqamətlər gərəkdir, istiqamətlər.

Bəla peymanəsin aşiqlərə lütf eyləmiş Yusif,
Bəli, əksik deyil piri-muğandan bu kəramətlər.





O necə könüldü ki, bənd olub səri-zülfi-yardə qəm çəkər?
O nə mübtəlayi-bəladı ki, sitəmi-nigardə qəm çəkər?

Gülü ətri-sünbülü yasəmən bürüyübdü səhfeyi-aləmi,
O necə səfehdi kim, yenə belə novbahardə qəm çəkər?

Sən o bumi-şumə nəzzarə qıl, gör onun nihadi-kəsifini,
Belə bir səfalı behiştdə, belə laləzardə qəm çəkər.

Sən o zövqsüz, o şüursuz səri-zahidə nəzər eylə kim,
Belə əsrdə, belə fəsldə oturub kənardə qəm çəkər.

O məhin cəmalü kəmalının işığı basıbdır bu aləmi,
Bu hənuz zülməti-cəhldən qalıb intizardə, qəm çəkər.

Ona kim deyər ki, fəhimdir, gecə-gündüz ahü fəğan ilə
Nə ki var, yox, hamı zadını uduzub qumardə, qəm çəkər?

Sakın, ey qələm, belə səpkidən, bu səyaq aşiqə xoş deyil,
Biri eyni qəmdə nişatı var, biri cəngi-tardə qəm çəkər.

Xələvati-eşqdə təşnələr gəzib abi-həyat dilər vəli,
Biri Yusifi-rəhi-həsr olur, biri payidardə qəm çəkər.

Bu zamani-əhdi-axirədə, bu iyirminci qərinədə
Necə ruhsuz heyvandı gör, belə ruzgardə qəm çəkər.



Sitəmindən, ey büti-səngdil, cigərim dönə-dönə parədir,
Bu nə zülmdür, bu nə cövrdür, bu nə zəxmdir, bu nə yarədir.

Gəhi qarə hacibin şivəsi, gəhi məst çeşmin işarəsi,
Bu nə işvədir, bu nə qəmzədir, bu nə şivədir, nə işarədir?

Rüxü zülfü çeşmü müjən sənin tənü canü dildə məkan tutub,
Biri can alan, biri qan tökən, biri qəsd edən dili-zarədir.

Nə ki xəlq var, bu bədihidir ki, gecə istirahət elər hamı,
O ki yoxdu rahəti yuxlamaz gecələr: mənimlə sitarədir.

Demə gün çıxar, yer işıqlanır, gecə ahım atəşi göylərə
O qədər çıxar ki, səhər bütün tökülən yerə o şərarədir.

Sitəmin verir mənə dərdü qəm, nəzərin qılır ona çarələr,
Bu necə sitəm, necə dərdü qəm, bu nə dərddir, necə çarədir?

Cəzəbati-eşq ilə müncəzib, xələvati-hicrdə müztərib,
Çü qəmində Yusifi-binəva çəməni-vüsalə həzarədir.





Açıb çəməndə o sərvi-səmənüzar üzar.
Gəlib tərənnümə hər guşədə həzar həzar.

Edəndə naz ilə ol kəbki-xoşxuram xuram,
Düşər dalınca könüllər quşu qətar-qətar.

Alıbdı cismdən ol çeşmi-natəvan təvan,
Olanda badədən ol nərgisi-xumar xumar.

Veribdi könlümə ol zülfi-purşikənc şikənc,
Edib nigahilən ol tiri-canşikar şikar.

Taparmı cismdə bu qəlbi-naşəkib şəkib?
Tutanda üzdə o geysuyi-biqərar qərar.

Hisari-ahən olub oxların, zibəski, gəlib
Çəkibdi dövrəmə ol ahənin hisar hisar.

Deyil bu indiki adət ki, eyləyib özünə
Cəfavü zülmü sipehri-sitəmşüar şüar.

Nə vəqt dövr qılıb aşiqin muradı ilə,
Həmişə kəc edib ol çərxi kəcmədar mədar.

Güzərgəhilə məzarım müqabil et, Yusif,
Olur ki, eyləyə bir xaki-rəhgüzar güzar.



Mehr asimanda cilvə edər, yer üzündə yar,
Yerdən göyə bu mehrin o mehrilə fərqi var.

O bir hilalə cilvə verir tazələnsə mah,
Bunda həmişə var iki əbruyi-canşikar.

Qəlbül-əsəddə yer üzünə o tökər şərər,
Bu gül üzündə var iki geysuyi-tabdar.

Bu öz iradəsiylə cahana verir ziya,
Məcburdur o verməsə onda yox ixtiyar.

Nəzzarəyə o mane olur baxmaq istəməz,
Amma bu göstərir üzünü xəlqə aşikar.

Nöqsan olur kəsuf ilə gah onda əqbətən,
Bunda tamam danə ki var süni-girdigar.

O bir giyahi-tazəni çox düşsə yandırır,
Bu bir giyahə can verir çün nükhəti-bahar.

Leylü nəhar zülfü rüxündəndi,Yusifa,
Quranda yazılır o ki,”Vəlleylü vənnəhar”.



Elmü əməlin söylədi danayi-həqiqət,
Çox fərqi var, ey talibi-cuyayi-həqiqət.

Hər elm ki var, zayeyü fanidir əməlsiz,
Təhqiqdir aləmdə təqazayi-həqiqət.

Əla səmərati-şəcəri-elm, əməldir,
İstərsən əgər olmağa binayi-həqiqət.

Hər elmi ki, təhqiq ilə bildin, əməl eylə.
Vaqiə budur gövhəri-dəryayi-həqiqət.

Zənn əhli həqiqət görə bilməz, bu yəqindir,
Çün eyləməyir heç təmənnayi-həqiqət.

Hər mətləbi öz əhli ilə məşvərət eylə,
Ta zahirə gəlsin düri-yektayi-həqiqət.

Əfkar dəyər bir-birə, məna çıxar ondan,
Bipərdə gəlir şahidi-zibayi-həqiqət.

Öz ətrin, əgər sən deməsən, bildirəcək müşk,
Ancaq bunu bil, eylə təmaşayi-həqiqət.

Elmü əməlin talibi ol, cəhd elə Yusif,
Əlbəttə, budur cövhəri-mənayi-həqiqət.



Badə təsirindən oldu çünki çeşmi-yar məst,
Olmasın mümkün deyil bəzm içrə hər huşyar məst.

Badəsiz çeşmi-siyahın məst olub qanlar tökər,
Vay əgər meydən ola ol nərgisi-xummar məst.

Qətlimə həmdastandır çeşmü müjganın fəğan,
Gör nə bidar eylər olsa türki-xəncərdar məst.

Olmamış məst iltifat etməz məni-biçarəyə,
Yarəb, olsun daima ol şuxi-şirinkar məst.

Məstkən gördüm xuraman qamətin, ey məh, dedim:
Kim görüb bu növilə sərv eyləsin rəftar məst.

Ta ki, Yusif surəti-ayinə kirdarın görüb,
Olmasın müşküldü misli-surəti-divar məst.

Dil ki var, ayinədir, hər surət olsa, göstərər,
Surət ol ayinədir, ayinə ol dildar məst.





Ey könül behcəti-hicründə könül qan oldu,
Yandı qəmdən bu sitəm xanəsi viran oldu.

Şad olan könlümü ey şux, qəmalud etdin,
Gördü düşmən məni bu hal ilə giryan oldu.

Çəkdiyim ahü fəğan etmədi təsir sənə,
Hər görən hali-dili-zarımı heyran oldu.

Bilirəm öldürəcəkdir məni bu möhnəti-hicr,
Olmadı çarə, dəxi dərd firavan oldu.

Olu bir gün ki, gəlirsən, "Hanı miskin Yusif",
Yusifin canı deyərlər sənə qurban oldu.

Getdi biçarə cahandan, gözə xaki-dərini
Tutiya eyləməmiş xak ilə yeksan oldu.





Hövzi-Kövsərdən əgər ahuyi-səhra içə su,
Çini-zülfün kimi mişkin ola bilməz ahu.

Buyi-zülfündən əgər ənbəri-sara vura dəm,
Nə verir anə cəvab eyləsələr rubəru.

Zülfi-pürçinə bərabərlik edər mişki-Xəta,
Kim vurar gör ki, müqabildə kim ilə pəhlu.

Əhli hər silsilənin silsilə qeydində əsir,
Aşiqi-bidilə ol, silsileyi-qaliyə bu.

Eşq üftadəsinin fikri dəmadəm “ya dust”,
Zülf divanəsinin əzbəri hər şəb “yahu”.

Çeşmi-məstin görəli aşiqi-bidil yeri var,
Tutsa Məcnun kimi hər ahuyi-səhra ilə xu.

Bənd ikən xatiri-mərdüm açılıb üqdələri,
Ah, yüz silsiləni etdi pərişan bir mu.

Qamətin sərvi gözüm mərdümini tutdu məkan,
Əşki-çeşmin axar ol sərvin ayağından cu.

Buyi-eşqin gələli qafiyeyi-Yusifdən,
Əlbəəl gəzsə səzavardı bu dəstnəbu.



Ey könül, yar üçün əğyar ilə yar ol, sözə bax.
Gül sevərsən sən əgər həmdəmi-xar ol, sözə bax.

Zülf zəncirinə bənd ol, özünü eylə xilas.
Tari var şəhnəvü şəbgirə düçar ol, sözə bax.

Şahlər didəsinə almaq üçün köhli-bəsər,
Asitanında şərəf gözlə, qübar ol, sözə bax.

Sözdür aləmdə, deyirlər ki, sözün nəfi nədir?
Söz tanı diqqət ilə təcrübəkar ol, sözə bax.

Ey deyən yox dəhəni-yarə, sözüm var, dayan,
Kərəm et mültəfiqi-ləli-nigar ol, sözə bax.

Rüxi-zibasına bax, baxma rəqibin sözünə,
Qədi-rənasını gör aşiqi-dar ol, sözə bax.

Zahida, sən bu qədər səcdəyə getdin, netdin?
Adəm ol, cənnəti bil, əqlşüar ol, sözə bax.

Səvəvər seyd eləyincə səni, ey teyri-həva,
Laməhalə, yenə şahbazə şikar ol, sözə bax.

Yusifa, hər sözə baxma o ki, lazımdı sənə,
Get rəhi-meykədə tut məstü xumar ol, sözə bax.



Şəhri-Gəncədə bir gün seyr edəndə mən nagah,
Gəncə şəhr bağında tuş olub mənə bir mah.

Hüsnü vəsfdən ari, xassə xülqü əhvalı,
Gənc onunla bir həmdəm, bəxt onunla bir həmrah.

Yox idi gümanımda, gəldi durdu yanımda,
Söylədi nə yerdənsən, əfv et, olma gəl ikrah.

Yusifəm,-dedim,-şairi-fani, şeirdə mahir,
Badikubə əhlindən biticarətü tənqah.

Bir dönüb mənə baxdı, söylədi təəccüblə:
"Badikubədən şair? Lailahəilləllah!"





Hüsnündə şübhə yox, eşqimdə iştibah,
Hüsn olsa eşq olur, bəs kimdədir günah?

Sən hüsn sacı, mən aşiqi-həzin,
Olmazmı aşiqə eşqin dəlili-rah.

Cazibdi kəhrəba, əlbəttə cəzb edər,
Məzurdu yəqin məczub olursa kah.

Bu rəmzi-eşqi məni-Fərhad bilməsən,
Şirində şur var, etməz sənə nigah.

Məşuq şahdır hərgah qulam ola,
Məğlubi-hüsn olur aşiq olursa şah.

Əbru ona kaman, qəmzə ona xədəng,
Geysu ona kəmənd, müjgan ona sipah.

Sular isə bağban, məqsudu meyvədir,
Amma bu beyndə su həm içər giyah.

Şah bəndəsin sevər, bəs sən də, ey şahım,
Biçarə Yusifə lüft eylə gahi-gah.

Verməz ziyavü nur, olmaz lətafəti,
Bizövq olursa şeir, bimehr olursa mah.



Tapmışam könlümü mən türreyi-cananda imiş,
Ah, cəmiyyəti-dil zülfi-pərişanda imiş.

Nəzər et zülfü rüxi-yarə ki, bir cənnətdir,
Laləvü sünbülü reyhan bu gülüstanda imiş.

Nitq şirinliyi ancaq o şəkərləbdə əyan,
Kəbk rəftarı tək ol sərvi-xuramanda imiş.

Vədeyi-vəsl hara, söhbəti-hicran demə kim,
Ləzzəti sübhi-vüsalın şəbi-hicranda imiş.

Yox imiş heç tərəfdə ədəbü elmü kəmal,
Nə ki, var elmü kəmal aləmi-ürfanda imiş.

Gördüm ol mahliqa hüsnünü, fəhm etdim kim,
Şövkətü şanü şərəf cümləsi insanda imiş.

Sureyi-Yusifə get diqqət ilə eylə nəzər,
Yusifa, eşqü məhəbbət sözü Quranda imiş.





Zülfi ki, anıb surəti-zibasına gəlmiş,
Zəngi tökə gülzar təmaşasına gəlmiş.

Bir camədi nazü rəvişü şivəvü rəftar,
Ancaq o nigarın qədü balasına gəlmiş.

Cənnət üzü, Kövsər ləbi, təfsiri-qiyamət,
Ol qaməti sərvin qədi-rənasına gəlmiş.

Dərk eyləməyən ruhi-Məsihanı təəccüb,
Musayi-kəlimin yədi-beyzasına gəlmiş.

Mehri eləmiş sahəti-sinəmdə təcəlla.
Musayi-zaman vadiyi-Sinasına gəlmiş.

Zahid ki, gəlib din ilə ayindən urar dəm.
Sözdür hamısı, pul təmənnasına gəlmiş.

Göz mərdümü görməkdən ibarətdir həqiqət,
Bu qətrəni gör əsildə dəryasına gəlmiş.

Hər "eyn" ki var, eşqü məhəbbətdən ibarət,
Hər "mim" ki var, meykədə mənasına gəlmiş.

Yusif, ürəyin xanəsini pak elə, çünki
Canan özü öz mənzili-məvasına gəlmiş.



Zövqi-vüsalə cilvə verən hicri-yar imiş,
Fəsli-xəzan nümayişi-fəsli-bahar imiş.

Ol məhvəşin üzündə imiş zülfi-pürxəmi,
Zülmat içində abi-həyat aşikar imiş.

Əzbəs ki, təngdir dəhəni, söz çətin çıxar,
Yoxdur deyən dəhanı üçün, həqqi var imiş.

Təhsili-elm imiş səbəbi-sərvəti-qəna,
Sərvət zəmanə əhli üçün iftixar imiş.

Hər bir vücüd sərvətə möhtac imiş fəqət,
Hər kim ki, elm sahibidir bəxtiyar imiş.

Var ehtiyacı, sülənirlər ehtiyacdən,
Çox vəqtlərdə seydə şahin şikar imiş.

Çox şirlər şikar olunub iftiqar içün,
Hər arslanı rubəh edən iftiqar imiş.

Simü zər olmayan kişidə olmaz etibar,
Malü mənalü zər səbəbi etibar imiş.

Sərvət birinciədd olunan bir vəzifədir,
Sərvət zəmanədə səbəbi-iqtidar imiş.

Yusif, o kim nə məknəti varmış, nə sərvəti,
Arif də olsa öz vətəni içrə xar imiş.



Üzari-alının, xət sərbəsər, piramənin tutmuş,
Görən, güldür, deyər kim, mişki-tər piramənin tutmuş.

Müsəlsəl zülfi-mişkin kim, tutubdur arizin hər yan,
Səhabi-tirədir guya ki, qəmər piramənin tutmuş.

Dəhanın sirri mübhəmdir, kəlamın ruhpərvərdir,
Miyanın muyi-nazikdir gələr piramənin tutmuş.

Cəmalın şəmsi-nurani, kəmalın feyzi-ruhani,
Ləbindir ləli-rümmani, şəkər piramənin tutmuş.

Könül bağında vəslindən xəyali-qəddü zülfünlə
Göyərmiş nəxli-ümmüdüm səmər piramənin tutmuş.

Fərağında tökər çeşmim sirişki-al peydərpey,
Zibəski, didəmi xuni-cigər piramənin tutmuş.

Əhatə eyləyib qəmlər könül mülkünü sərtasər,
Necə kim, ləşkəri-müjgan bəsər piramənin tutmuş.

Dəyib ətrafdən, Yusif, zibəs ki, tənələr tiri,
Könül bir mürğ olubdur balü pər piramənin tutmuş.



Hüsni-işrət o məhi-xoşxəttü xalımda imiş.
Aləmin ləzzəti əyyami-vüsalımda imiş.

Ləzzətin bilməmişəm dərdü məlali-eşqin,
Eşq ləzzati mənim dərdü məlalımda imiş.

Ah, bildim ki, nədir ahi-dəmadəm səbəbi,
O nigarın həvəsi-zülfü xəyalımda imiş.

Mehri-ruyində hilalın yox imiş nöqsanı,
Nəqsü nöqsan mənim fəhmü kəmalımda imiş.

Zahidin öylə bilirdim ki, cəhəmməmdi yeri,
Demə cənnət açarı küllən o zalımda imiş.

Yusifa, mehrü məhəbbətdə imiş hər nə ki var,
O da küllən o məhi-mehrxisalımda imiş.



**MÜNDƏRİCAT**

